**Azərbaycan Respublikası**
**Bakı İslam Universitetinin**
**Zaqatala Şöbəsi**

Kitabın adı:
**QURANİ-KƏRİMİN TƏCVİDİ**

Müəllif:
**Heyət**

Elmi Redaktor:
**Dr. Əhməd Niyazov**

Məsləhətçi:
**BİU-nun Zaqatala şöbəsinin müdiri**
**İbrahim İbrahimov**

Dizayn:
**Sərxan İsgəndərov**

Bu kitab Bakı İslam Universitetinin Zaqatala şöbəsi üzrə Pedaqoji Şuranın 24 aprel 2008-ci il tarixli V iclasının 5 saylı qərarı ilə çap edilmişdir.

**Ünvan:**
Zaqatala şəh. H. Əliyev prospekti №88/A
İndeks: AZ 6200

Tel./Faks: (+994) 174 5-21-83 & 5-32-46
www.zaqatalailahiyyat.edu.az
Dərs kitabları - 08

**Zaqatala-2008**

**MÜNDƏRİCAT**

**ÜÇÜNCÜ BÖLMƏ**

**QURAN ÖYRƏTMƏ VƏ ƏZBƏRLƏMƏDƏ BƏZİ MƏSƏLƏLƏR**

# ÖN SÖZ

Hər şeydən əvvəl Qurani-Kərimin düzgün oxunma qaydası olan təcvid adında bir kitabın Azərbaycan dilində hazırlanması imkanını bizə bəxş edən Cənabı Allaha sonsuz həmdü-sənalar, Onun uca Peyğəmbəri Həzrət Mühəmməd (s.ə.s) əfəndimizə bol-bol salam olsun.

Bildiyimiz kimi xalqımız əvvəllərdən bəri İslam dinini mənimsəmiş və onun qaydalarını bizə çatdıran Quranı hər zaman oxumuşdur. Müxtəlif şəkildə tərcümələr və yaxud təfsirlər yazılmışdır.Ancaq görünən bir həqiqət vardır ki, Quranın oxunma qaydaları olan təcvid elmi haqqında dilimizdə yazılmış geniş miqyaslı bir kitab yoxdur.Biz bu məqsədlə gücümüzün və imkanlarımızın çatdıqı qədər xalqımıza faydalı olması məqsədilə bu kitabın hazırlanması qərarına gəldik.

Kitabımız üç bölmədən  ibarətdir. Birinci bölmədə Qurani-Kərim haqqında ümumi məlumatlar verilmişdir. Quranın yazılması, toplanılması, hərəkələnməsi və çoxaldılması məsələlərindən bəhs edilmişdir. Daha sonra bu bölmədə Quran oxumağın və oxuyanın fəziləti haqqında məsələlər ye alır. Qiraət və Quran tilavəti ilə əlaqəli bir sıra məsələlər incələnmişdir.

İkinci bölmədə Təcvid elmindən danışılır. Burada təcvid haqqında ümumi məlumatlar verilərik hərflərin məxrəc və sifətlərindən, məd qaydaları, tənvin və sakin nunla əlaqəli məsələlər, idğam bəhsi, səktə, vəqf və ibtida ilə əlaqəli məsələr yer almışdır.

Üçüncü bölmədə isə Quran öyrətmə və əzbərləmədə bəzi məsələlər izah edilmişdir. Burada quran öyrətmə metodu, hafizlik etmək üçün məlumat və dodaq talimi ilə əlaqəli mövzulara yer verilmişdir.

Kitabın hazırlanmasında Prof.Dr.İsmail Karaçamın “Kurani-Kerimin Faziletleri ve okunma kaideleri” adlı əsərdən istifadə olunmuşdur.

Əsərin ortaya çıxmasında əməyi keçən hər kəsə minnətdarlığımızı bildiririk.

# BİRİNCİ BÖLMƏ

## I. QURANİ-KƏRİM HAQQINDA ÜMUMİ MƏLUMATLAR

### A. QURANİ-KƏRİMİN TƏRİFLƏRİ

Quran ləfzi lüğət mənası etibarilə, Qiraət kəlməsi ilə eyni mənaya gəlir və Səmai (qayda xarici) bir məsdərdir. “Oxumaq və cəm etmək” vəya bir başqa ifadə ilə də, “toplayıb bir araya gətirmək” mənalarına gəlir. Cəbrail vasitasilə, Muhamməidə (s.ə.s) endirilən Kitabı- Cəlilə xüsusi isim olmuşdur. Çox-çox oxunan kitab deməkdir. Bu isim Qurani-Kərimə Allah tərəfindan verilmişdir.[1]

Quranın elmi təriflərindən İbnül-Cəzərinin tərifi də belədir:

فَكُلُّ مَا وَافَقَ وَجْهَ نَحْوٍ - وَكَانَ لِلرَّسْمِ احْتِمَالاً يَحْوِى
وَصَحَّ إِسْنَادًا هُوَ الْقُرْآن - فَهذِهِ ثَلاَثَةُ اْلأَرْكَانُ

İstər əsəh (müttəfəqün əleyh: üzərində ittifaq olan), istər fəsih yəni müxtələfün fih (ixtilaflı) olsun;

---

[1] Bax. Yusuf, 2, Zümər 27-28, Qiyamə 17-18, Müzzəmmil 4 v. b.

1. Ərəb nəhvi qaydalarından birinə uyğun;

2. Rəsm (yazı) etibarilə də Həzrət Osman Mushaflarından birinin yazı şəklinə uyğun olan;[2]

3. İsnad baxımından da, ədalət və zəbt sahibi ravilərdən ibarət səhih və müttasil bir sənədlə, Peyğəmbərə (s.ə.s) qədər çatan bütün Qiraət vəcihlərinə Quran deyilir.

Onun sayılmayacaq qədər xüsusiyyətləri yanında beş dənəsi vardır ki, Quran özünü hər yerdə digər bütün sözlərdən bu beş vəsfilə ayırır:

1. Müciz (Möcüzəvi) olması: Yəni heç bir güc tərəfindən, ən qısa bir ayəsinə belə bənzər bir ayə yazıla bilməmiş və yazıla bilməyəcəkdir.

2. Quraniyyətinin təvatürlə sabit olması.

3. İstər dəstəmazlı, istər dəstəmazsız, istər əzbərdən, istərsə də üzündən olsun, oxunmasının ibadət sayılması.

4. Ərəbcə olan ləfzindan başqa, heç bir dil ilə yazılıb oxunmasının, Quran qəbul edilməməsi.

5. İstər yazmaq, istər söyləmək surətilə olsun nəql edərkən orijinal dediyimiz əsl mətnilə birlikdə nəql edilməsinin vacib olmasıdır.

## B. VƏHYİN BAŞLANĞICI VƏ QURANIN TƏSBİTİ

Etibarlı qaynaqların bildirdiyinə görə, ilk ayələr nazil olmağa başladığında, Peyğəmbər (s.ə.s) 40 yaşında idi. Ələq Surəsinin ilk beş ayətilə başlayan Quranın nüzülü hadisəsi 23 il davam etmişdir.

Quranın nüzülündəki tədriciliyi Quranın özü belə açıqlayır: *"İnkar edənlər: 'Quran Ona bütöv bir şəkildə endirilməli deyilmiydi?' dedilər. Biz onu sənin qəlbinə yaxşı bir şəkildə yerləşdirmək üçün belə (parça-parça endirdik) və onu dənə-dənə (ayıraraq) oxuduq."*[3]

Qurani-Kərimin yeddi hərf üzərə nazil olduğunu xəbər verən ravilərin sayı olduqca çoxdur. Bundan dolayı da alimlər bu xəbərin təvatürlüyünə hökm

---

[2] Bu eynı zamanda bütün qiraət vəcihlərini əhatə edən bir yazı deməkdir.

[3] Furqan 32.

etmişdirlər. İmam Cəzərinin bu xüsusda ətraflı tədqiqat nəticəsində söylədikləri xülasə olaraq belədir. "Peyğəmbərin (s.ə.s) hədisilə işarə olunan yeddi hərf ixtilafı, tənəvvü və təğəyyür ixtilafıdır. Ziddiyət və tənaqüz ixtilafı deyildir. (Yəni müxtəliflilik və fərqlilik ixtilafıdır; tərslik və zidlik ixtilafı deyildir). Çünki Allah Kəlamında ziddiyyət və tənaqüz ixtilafı düşünülə bilməz. Bu hal, *"Quranı düşünmürlərmi? Əgər o Allahdan başqası tərəfindən olsaydı, içində bir-birini tutmayan çox şey taparlardı"* şəklində məna verilən Nisə Surəsinin 82-ci ayəsi ilə bəyan edilmişdir." Qurani-Kərim bütün qiraət şəkillərilə, Həzrət Osman tərəfindən daha Mushaflar yazdırılmadan və Həzrət Əbu Bəkir dövründə kitab halına gətirilmədən öncə Həzrət Peyğəmbərin bir çox əshabı tərəfindən də əzbərlənmişdir. Bundan əlavə Həzrət Peyğəmbər səhabədən oxuma-yazması yaxşı olanlardan bəzilərini özünə vəhy yoluyla gələn ayələri yazdırmaqla da vəzifələndirmiş ki, bunlara "*vəhy katibləri"* deyilir. Cəzəri bunlardan 40 dənəsinin isimlərini kitablarında zikr etmişdir. Müxtəlif qaynaqlarda, Cəzərinin zikr etdiyi bu isimlərdən başqa bir çok səhabənin də vəhy katibi olaraq qeydlərə keçdiyini görürük. Bu da onu göstərir ki, Quran ayələri daha peyğəmbərin hayatında çox kimsələr tərəfindən yazılmışdır. Bu katiblər, Quranın tamamını həm yazmışlar, həm də əzbərləmişlər. Bundan əlavə hər yazdıqları nüsxədən bir surət də özləri üçün yazıb saxlamışlar.

## C. QURANIN HƏZRƏTİ ƏBU BƏKİR TƏRƏFİNDƏN CƏM EDİLMƏSİ

Həzrət Peyğəmbərin vəfatından sonra xilafət vəzifəsinə gətirilən Həzrət Əbu Bəkir Quran ayələrinin bir mushafda toplanması məqsədilə bir komissiya qurdu. Bu komissyanın başqanlığına Həzrət Peyğəmbərin vəhy katiblərindən olan Həzrət Zeyd b. Sabiti qoydu.

Zeyd b. Sabitin Quranı toplama proqramı:

Zeyd b. Sabit Quran ayələrini cəm edib toplayarkən belə hərəkət edirdi:

1. Hafizəsində (əzbərində) və ya əlində Qurandan parçalar gördüyü kimsələri tanımadıqca,

2. Tapılan səhifələrin, Peyğəmbərin (s.ə.s) hüzurunda yazıldığına aid qəti bir qənaətdə olmadıqca,

3. Tapılan səhifələrin, Peyğəmbərin hüzurunda yazıldığına aid ən az iki və ya daha çox şahid görmədikcə,

4. İstər hafizələrdə, istər yazılı mətinlərdə olsun, bunların öz əzbərindəkilərlə eyni olduğunu isbat etmədikcə heç bir kimsədən Quran parçası olaraq bir şey qəbul etməzdi.

Zeyd b. Sabitin tək nüsxə olaraq toplamış olduğu ilk Quran nüsxəsini, Həzrət Əbu Bəkir aldı və ölüncəyə qədər də onu mühafizə etdi. O vəfat etdikdən sonra həmin nüsxəni yerinə keçən Həzrət Ömər təfil aldı. O da ölümünə qədər bu böyük əmanəti mühafizə etdi. Onun vəfatından sonra isə bu mushaf, Həzrət Ömərin qızı və Peyğəmbərimizin xanımı olan Həzrət Hafsaya intiqal etdi.

## Ç. QURANIN HƏZRƏT OSMAN TƏRƏFİNDƏN ÇOXALDILMASI

Həzrət Osmanın xəlifəliyi əsnasında etdiyi xidmətlərin ən böyüyü müsəlmanları bir mushaf və bir qiraət üzərində birləşdirmiş olmasıdır. O da bu iş üçün Zeyd b. Sabiti vəzifələndirmişdir. Əshabi-Kiram arasında, hər kəsin tanıyıb güvəndiyi, ədalət və zəbt sahibi olan Zeyd b. Sabit və üç dostu tərəfindən meydana gətirilən "Quranı Tədqiq və İstinsax Komissyası" Həzrət Hafsadan gətirdilən ana mushafdan kopya ettikləri Quran nüsxələri üzərində tərtib və tədbir baxımından əsas olaraq bu 6 xüsusa diqqət çəkmişdirlər:

1. İlk sıranı Fatihə, son sıranı da Nəs surəsinə məxsus etmişdirlər.

2. Tövbə surəsi xaricində hər surənin başında olan bəsmələləri yerlərində buraxmışlar.

3. Təqsir edilən nüsxələrin Həzrət Əbu Bəkirin əmrilə toplanan ana mushafa uyğun olması üçün də, o nüsxələri, surələrin isim və nisbələrindən; ədəd, cüz və fasilə kimi incəliklərdən təmizləmişlər.

4. Allah Rəsulunun tövsiyələrilə, sübut və nəql olunan səhih rəvayətlərin hamısını əldə etmələri və Quranın nəqlindəki əsl prinsipin yalnız rəsmi xəttə deyil, hifzə dayandığının bilinməsi məqsədilə də, təqsir edilən bu mushafları nöqtə və hərəkə kimi ünsürlərdən uzaq tutmuşlar.

5. Çoxaldıldıqdan sonra tədqiq komissyası tərəfindən özlərinə oxunaraq ərz edilən hər bir mushafın yazı şəklinə əshabdan heç bir fərd etiraz etməmişdir.

6. Təqsir edilən bu mushaflardan hər hansı birinə uymayan, içərisində artıqlıq və ya əksiklik olan, istər asanlıq, istər təfsir məqsədilə olsun kəlmələri başqa eyni mənalı ləfizlərlə dəyişdirilmək surətilə xüsusi şəxslər tərəfindən rəsmi olmayan yollarla yazılan mushafların, kimdə olursa olsun, Qurani keyfiyyətlərini itirmiş olduqlarından tərk və yox edilmələrinə ittifaqla qərar verilmişdir.

**1. Həzrət Osman Mushaflarının Yazı Tərzı**

Həzrət Osmanın çoxaltdığı mushaflar Küfi yazı ilə yazılmışdır. Cəzm, Təşdid (şəddə) və sair işarələrdən heç biri əsl rəsm (yazı və imla) da yoxdur. Sonradan hürufu-mücəməyə nöqtə, hürufu-sakinəyə cəzm, hürufu-mütəhərrikəyə hərəkə, hürufu-tənviniyə iki cəm hərəkə, hürufu-müsəqqələyə təşdid və hürufu-məhmuzəyə də əyri həmzə icad edilmişdir. Əslində bütün bunlar bidətdir (sonradan əlavə edilmişdir). Fəqət Quranı öyrənərkən əcəmilərə asanlıq saxladığı üçün müstəhsən (gözəl) görülmüşdür.

**2. Həzrət Osman Quranlarının ortaq xüsusiyyətləri**

1. Bu Quran nüsxələrinin hər birinə, rəvayətləri əhəd olan qiraət vəcihlərinin xaricində, sadəcə təvatürlə sabit olan vəcihlər alınmışdır.

2. Ərzei-axirədə (Həzrət Peyğəmbərlə Cəbrailin bir-birlərinə Quranı qarşılıqlı ərz etdikləri son müqabələ) sabit olmayan və tilavəti mənsüx olan qiraətlər də bu nüsxələrə alınmamışdır.

3. Ayələri Həzrət Əbu Bəkirin cəm etdirmiş olduğu mushafdakı tərtibə uyğun olaraq saxlanılmışdır. Surələri isə bugün əlimizdə olan mushafların tərtibinə görə sıralanmışdır.

4. Rəsmi xətləri, müxtəlif qiraət vəcihlərinə və Quranın özü ilə nazil olduğu yeddi hərfi əhatə edən bir üslub ilə qələmə alınmışdır.

5. Səhabələrdən bəzilərinin, özləri üçün xüsusi olaraq yazdıqları mushaflarda olan və hər hansı bir mənanın təfsiri, yaxud da nəsx və mənsüxü bəyan edən və ya başqa şərh ifadələri də bu Quran nüsxələrindən heç birinə alınmamışdır.

## II. QURANİ-KƏRİM VƏ FƏZİLƏTLƏRİ

### A. QURAN OXUMANIN FƏZİLƏTİ

Həzrət Allahın ilahi kəlamı olan Qurani-Kərimi oxumaq əcir və savabı ən yüksək olan ibadətlərdən biridir. Necəki bir ayəti kərimədə Cənabı-Allah belə buyurur:**“Allahın Kitabını oxuyan, namaz qılan, özlərinə verdiyimiz ruzilərdən (Allah yolunda) gizli və aşkar xərcləyənlər kasad olmayacaq bir ticarət (savab) umarlar ki, (Allah) onlara (əməllərinin) mükafatlarını versin və Öz lütfündən (kərəmindən) onlara artırsın! Həqiqətən, (Allah) bağışlayandır, qədirbiləndir! (Bəndələrinə Ona etdikləri şükür müqabilində bol nemət əta edər)”** (əl-Fatir, 35 / 29-30)

Həzrət Peyğəmbər Əfəndimiz də Əbu Zərə xitabən belə demişdir: *“Ey Əbu Zər, Allahın kitabından bir ayə öyrənmək üçün səhər evindən çıxman, sənin üçün yüz rəkət namaz qılmandan daha xeyirlidir”.* (İbn-i Macə, *Sünən,* I, 79)

Bu mövzu ilə əlaqəli ayə və hədisləri çoxaldmaq mümkündür. Bu mövzu haqqındakı dəlillər, Quran oxumanın çox fəzilətli bir ibadət olduğunu ortaya qoyaraq bütün müsəlmanları Quran oxumağa təşviq edir.

### B. QURAN OXUYANIN FƏZİLƏTİ

Qurani-Kərimi şanına və ülviyyətinə uyğun olaraq oxuyan, Onun əmr etdiyi şəkildə əməl edən kimsələri, Rəsulullah (s.ə.s) öymüş və təqdir etmişdir. Bu xüsusla əlaqəli hədislərin bəziləri belədir:

*“Quran oxuyan mömin, qoxusu və dadı gözəl olan portağal kimidir. Quran oxumayan mömin, dadı gözəl fəqət qoxusu olmayan xurma kimidir. Quran oxuyan münafiq*[4] *qoxusu gözə,amma dadı acı olan reyhan (nanə) kimidir. Quran oxumayan münafiq isə qoxusu olmayan acı Əbu cəhil qarpızı (dadı və qoxusu olmayan acı bir meyvə) kimidir.* (*Buxari,* VI, 107)

Başqa bir hədisdə isə; *“Hafiz olub Quran oxuyan kimsə, mələklərlə bərabərdir. özünə çətin gəldiyi halda Quran oxuyana isə iki qat savab vardır”* (*Buxari,* VI, 80) buyurulmuşdur.

[4] Buxaridə münafiq kəlməsinin yerinə “əl-facir” keçir.

Həzrət Əlidən Peyğəmbər əfəndimizin (s.ə.s) belə dediyi rəvayət edilir. *“Kim Quranı oxuyar və Onu əzbərlərsə Allah onu cənnətinə soxar və ailəsindən cəhənnəmə girməyi haq edən on nəfərə şəfaət etmə haqqı verər”*. (*Sünən-i İbn Macə*, I, 78)

Həzrət Peyğəmbər əfəndimizin bu hədisləri Quranı layiqilə oxuyanlar və oxumağa çalışanlar üçün eyni zamanda böyük bir müjdə mahiyyətindədir. Hədislərdə də qeyd edildiyi üzərə Quran oxuyan kimsə sadəcə özünə deyil, digər insanlara da bir çox xeyrin qapısını açmaqdadır. Bu xeyrin qarşılığı həm dünyada, həm də axirətdə görüləcəkdir. Allahın kitabı olan Quranı oxumaq müsəlmanlar üçün tərkedilməz bir ibadətdir. Bu başlıq altında yazmış olduğumuz birinci hədisdə də görüldüyü üzərə Quran oxuyan möminin halı həm dadı, həm də qoxusu çox gözəl olan portağala bənzədilərək, hadisənin həm maddi, həm də mənəvi şəklinə ayrı-ayrılıqda vurğu edilmişdir. Çünki gözəl qoxu, insanlara müsbət yöndə təsir etmədə mühim bir vasitədir. Quranı üsuluna uyğun oxuyan mömin də, bu əməli sayəsində çox kimsəyə təsir etmək gücünə sahibdir.

Verdiyimiz bu bilgilərdən sonra Quranı əzbərləmənin və öyrətmənin dinimizdəki yerini də qısaca açıqlayaq.

Quranı əzbərləmək (hifz etmək) və Onu başqalarına öyrətmək fərzi-kifayədir. Belə ki, təvatür ədədinə çatan bir qrup tərəfindən bu vəzifə yerinə yetirilərsə, digər bütün müsəlmanlardan bu vəzifə düşmüş olar. Əks təqdirdə ümmətin hamısı günahkar olar.

Quranın hamısının əzbərlənməsi də yenə fərzi-kifayədir. Fəqət namazda oxunması lazım olacaq qədər Quran əzbərlənməsi fərzi- ayndır. Yəni hər müsəlmanın üzərinə fərzdir.

## C. QURANI MƏQAM İLƏ OXUMAQ

Qurani-Kərimi oxuyarkən tərtilə riayət etməklə birlikdə Onu səs ilə bəzəmək dinimizin bir əmridir. Bu xüsusda Peyğəmbər əfəndimizdən (s.ə.s) bir çox hədis rəvayət edilmişdir. Quranı təğənni ilə oxumaq Onu dinləməyə sövq edən amillərdən biridir ki, bu şəkildə oxumaq insanın nəfsinə və qəlbinə nüfuz edərək açıq bir şəkildə ona təsir edər. Çünki gözəl səs Quranın

gözəlliyini artırır. Fəqət burada bir şeyi dərhal qeyd etməyimiz lazımdır ki, Quran oxunarkən ediləcək məqam və təğənni, Onun ləfizlərinin təcvidini və təlimini pozmamalıdır. Çünki səsi güzəlləştirməkdən məqsad Quran oxuyarkən mənaya görə səsə hərəkət, hüzün və xüşu verməkdir. Bu mənada İmam Nəvəvi Quran oxuyarkən səsi güzəlləşdirmənin müstəhab olduğunda alimlərin ittifaq etmiş olduqlarını zikr edir.

Həzrət Pəyğəmbər Əfəndimiz (s.əs) bir hədisində; *"Quranı səsinizlə bəzəyin"* (Əbu Davud, I, 338; Nəsəi, II, 139) buyurmuşdur. Bir digər hədisdə; *"Səslərinizlə Quranı bəzəyin. əlbətdə ki, gözəl səs Qurana gözəllik qatar".* (Dərimi, II, 474) buyurulmuşdur. Yenə Həzrət Peyğəmbər Əfəndimiz (s.əs) Məkkənin fəthi günündə şəxsən özü əl-Fəth surəsini oxuyarkən "tərci'" etmişdir. əl-Ayni "tərci'" kəlməsini, səsi dəyişdirmək və dilədiyi səs ilə təğənni etmək olaraq açıqlamışdır.[5]

Rəvayət edilən hədislərdən də başa düşüldüyü kimi, Həzrət Peyğəmbər əfəndimiz (s.ə.s) gözəl bir səslə Quran oxumağa Allah tərəfindən izin verildiyini xəbər verir. Həzrət Ömər, İbn Abbas, İbn Məsud kimi səhabələr də Quranın məqamla və gözəl səslə oxunabiləcəyi görüşündədirlər. İmam Əbu Hanifə və İmam Şafii də Quranın məqamla oxunmasının caiz olduğu qənaətindədirlər. Bundan əlavə əgər məqamla oxumaqdan məqsəd, qiraət əsnasında səsi, hərflərin məxrəclərinə, sifətlərinə uyğun və təcvidin bütün incəliklərinə raiyət etmək surətilə bəzəmək isə, bunun haram olduğunu heç bir İslam alimi iddia etməmişdir.

## III. QİRAƏT ELMİNƏ ÜMUMİ BİR BAXIŞ

### A. QİRAƏT ELMİLƏ ƏLAQƏLİ ÜMUMİ MƏSƏLƏLƏR

Lüğət etibarilə "oxumaq və tilavət etmək" manalarına gələn qiraət, elm olaraq da "Qurani-Kərimin kəlmələrinin tələffüzlərini və bunların müxtəlif vəcihlərlə oxunuş tərzlərini ravilərinə isnad edərək bildirən bir elmdir" şəklində tərif edilmişdir.

[5] el-'Aynî, *Umdetu'l-Kârî,* IX, 329, 344.

**1. Qiraət elminin mövzusu**

Allahın Kəlamı olan Qurani-Kərimdir. Qiraət elmi, Qurani-Kərimə aid kəlmələrin tələffüzləri, bunların əda və icra şəkilləri üzərində durur və bunların, Sünnə və İcmadan çıxan Həzf, Isbat, Təhriq, Isqan, Fəsl, Vəsl, Nəql, Mədd, Qəsr vs. ixtilaflarıyla məşgul olur.

Quranın müxtəlif oxunuş şəkilləri vardır. Bunlara hərf və ya vəcih deyilir (cəm şəklində isə; hüruf, vücuh). Bunların hər biri bir qariyə (oxuyucuya) isnad edilmiş və bu yolla da Rəsulullaha (s.ə.s) qədər çatmışdır. Bunlardan hər birinə isnad edilən vücuhatın (vəcihlərin) hamısına birdən qiraət adı verildiyi kimi, bir ayədə olan və hər biri bir başqa qariyə (okuyucuya) isnad edilən vücuhatın, bir dəfədə fasiləsiz olaraq oxunmasına da qiraət deyilir.

Hər müstəqil qiraətin, bir dəfədə fasiləsiz oxunmasına isə Tilavət deyilir. Təlim-tərbiyə baxımından birincisi; ibadət olması baxımından da ikincisi daha məqbuldur.

Qiraət elmi, Qurani-Kərimlə çox yaxın bir əlaqəsi olduğundan şəri elmlərin ən şərəflisidir. Müsəlmanlar üzərinə bu elmi öyrənmək fərzi-kifayədir. Bu elmin faydası; Quranın kəlmələrini tələffüz xüsusunda xatadan qorumaq, təhrif və təğyirdən (dəyişiklikdən) mühafizə etmək, qiraət imamlarının qiraətini bilmək və bir-birindən təfriq etməkdir (ayırmaqdır).

**2. Qiraət terminləri və imamları**

Yuxarıda da qısa olaraq bildirdiyimiz kimi qiraət elmi; Quran kəlmələrinin əda keyfiyyətlərini və ixtilaflarını, nəql edənlərə nisbət edərək bilməkdir. Bu elm təcvid elmilə əlaqəli olaraq, tələffüzlərindəki ixtilaf və ədalarındakı keyfiyyət baxımından Quran kəlmələrini incələyir. Bu elmi öyrənmək və öyrətmək müsəlmanlar üzərinə fərzi-kifayədir. Qiraət elmilə əlaqəli terminlərin qısa tərifləri belədir:

1. Qürra: Lüğətda  qari (oxuyucu, oxuyan) kəlməsinin cəmidir. Temrin olaraq isə yeddi və ya on qiraətin özlərinə isnad olunduğu imamlara deyilir. Günümüzdə yeddi ya da on qiraəti öyrənib bunları oxumağa icazəli kimsələrə də bu ad verilir.

2. Əda: Qiraəti şəxsən ustadın ağzından almaqdır. Əhli-əda da qiraəti məşayixin ağzından alan şəxsdir.

3. Ərz: Bir ustadın hüzurunda Qurani-Kərimi oxuyaraq ondan qiraət almasına deyilir.

4. İstima: Bir tələbənin, Quranı ustadını dinləyərək öyrənməsinə deyilir.

Günümüzdə qiraət deyildiyində ağla ilk gələn tilavət mənasında, insanın Qurani-Kərimi oxumasıdır. Tilavət isə, oxumaq və ya səsli oxumaq manalarına gəlir. Bu da dodaqlardan səs çıxmasıyla olur. Bir kimsənin, dodaqlarını yumaraq içindən oxuması və ya kəlmələri ağlından keçirməsi tilavət sayılmayacağı kimi, bu şəkildə qılınan bir namaz da səhih olmaz.

Qiraət elminin kitablara nəql edilməsinə qədər, hafiz və qiraət alimləri qiraət vəcihlərini bir-birinə öyrətmişlər. İlk dəfə qiraət elmini qələmə alan Əbu Übeydə əl-Qasım b. Səllam (224 / 838) olmuşdır. Hicri ikinci əsrin başlarında, bəzi bölgələrdəki müsəlmanların öz qiraətlərini başqa bölgələrin qiraəti ilə əvəz etməyə başlamasıyla “yeddi qiraət” təbiri şöhrət tapmışdır. Beləcə Məkkədə İbn Kəsir, Mədinədə Nəfi, Şamda İbn Amir, Bəsrədə Əbu Amr, Küfədə isə Asim və Həmzənin qiraətləri məşhur olmuşdur.

Hicri üçüncü əsrdə qiraətləri yeddiyə təxsis edən, imamları və təmsil etdikləri qiraətləri müəyyən üsullar qoyaraq təsbit edən Əbu Bəkr b. Mücahid ( 324 / 935) olmuştur.

İbnül-Cəzəri məşhur və mütavatir qiraətlərin sayının on olduğunu iddia etmişdir. Məşhur qiraət imamlarını və ravilərini rəmzlərilə bərabər bir cədvəl halında bu şəkildə xülasə etmək mümkündür.

| | İMAMLARIN | | BİRİNCİ RAVİNİN | | İKİNCİ RAVİNİN | |
|---|---|---|---|---|---|---|
| No | Rəmzi | İsmi | Rəmzi | İsmi | Rəmzi | İsmi |
| 1. | ا | Nafî (نافع) | ب | Qalun (قالون) | ج | Verş (ورش) |
| 2. | د | İbn Kəsir (ابن كثير) | هـ | Bəzzi (بَزّى) | ز | Qünbül (قنبل) |
| 3. | ح | Əbu Amr (ابو عمرو) | ط | Düri (دورى) | ى | Süsi (سوسى) |
| 4. | ك | İbn Amir (ابن عامر) | ل | Hişam (هشام) | م | İbn Zəkvan (ابن ذكوان) |
| 5. | ن | Asim | ص | Əbu Bəkir (vəya) Şu'bə | ع | Hafs |
| 6. | ف | Həmzə (حمزة) | ض | Xaləf (خلف) | ق | Xallad (خلاد) |
| 7. | ر | Kisai (كسائى) | س | Əbul-Haris (ابو الحارث) | ت | Hafsı Düri (حفص دورى) |
| 8. | جع | Əbu Cəfər (ابو جعفر) | عى | İsa b. Vərdan (عيسى بن وردان) | جم | Süleyman Cəmmaz b.Cəmmaz (سليمان بن جَمّاز) |
| 9. | يع | Şeyx Yaqub (يخ يعقوب) | يس | Ruveys (رُوَيس) | حه | Rəvh (روح) |
| 10. | ل | Xələfi-Aşir (خلف عاشر) | سح | İshaq (اسحق) | سه | İdris (ادريس) |

**3. Səhih Qiraətlərdə lazım olan şərtlər**

Qiraət alimləri, Quran qiraətlərinin səhih sayıla bilməsi üçün bəzi şərtlər qoymuşlar. Bu şərtlərə uyğun gələn qiraətlər səhih, uyğun gəlməyənlər isə keçərsiz və batil sayılmışdır. Səhih qiraətin şərtləri bütün qaynaqlarda üçdür.

a. Qiraət, bir vəchilə də olsa ərəb qrammatikasına (nəhvə və sərfə) uyğun olmalıdır. Burada bir vəchilə kəlməsindən məqsəd, qrammatika qaydalarından hər hansı birinə uyğun olmasıdır. Çünki bəzi qrammatika qaydalarında dil alimləri ixtilaf etmişdirlər. Bu kimi hallarda səlahiyyət sərf və nəhivçilərdə deyil, qiraət imamlarındadır.

b. Qiraət, səhih və müttəsil bir sənədlə, Peyğəmbər əfəndimizə (s.ə.s) çatmalıdır. Eynilə hədis elmində olduğu kimi qiraəti rəvayət edən kimsələr ədalət və zəbt yönü qüvvətli olan kimsələr olmalıdır və onlar tərəfindən sənədində qopuqluq olamadan Həzrət Peyğəmbərə (s.ə.s) qədər çatmış olmalıdır.

c. Qiraət, Həzrət Osmana nisbət edilən mushaflardan birinin xəttinə uyğun olmalıdır. Həzrət Osmanın istinsax etdirdiyi Quranlarda bilindiyi kimi nöqtələmələr və hərəkələmələr edilməmişdir. Bundan əlavə bu mushaflar birdən çox qiraət vəchini əhatə edəcək şəkildə xüsusi bir imla ilə yazıldıqlarından, qiraət bunlardan birinə uyğun olmalıdır.

Bu üç şərti daşıyan qiraətlər rəd və inkar oluna bilməz. Əgər bu şərtlərdən biri əksik olarsa, bu qiraətə zəyif, şaz ya da batil deyilir.

**4. Bəzi qiraət terminləri və tərifləri**

1. Qiraət: Qiraət imamlarından birinin rəvayət və tariqlərinin ittifaqı şərtilə sahib olduğu məzhəbidir.

2. Qürra: Lüğətdə qari (oxuyucu, oxuyan) kəlməsinin cəmidir. Temrin olaraq isə yeddi və ya on qiraətin özlərinə isnad olunduğu imamlara deyilir. Fəqət günümüzdə bu kəlmə dar mənada işlədilərək, Qurani-kərimin bir deyil, digər qiraətlərini də oxuya bilən kimsələrə də deyilməyə başlamışdır.

3. Rəvayət və Ravi: Bir imamın ravilərindən birinin, digərinə müxalif olan qiraəti və ya bir raviyə nisbət olunan hər ixtilafa rəvayət deyilir. Ravi isə imamından qiraət rəvayət edən kimsədir.

4. Təriq: Ravilərdən sonra gələnlərin ixtilaflarına deyilir. Digər bir ifadə ilə; bir ravidən rəvayət edənlərdən birinin eynı səviyyədəki digər birinə müxalif olan qiraətidir.

5. Vəcih: Bir qiraətin imam, ravi və ravinin ravisi xaricində əhli-ədadan birinə nisbət edilməsinə deyilir.

6. İnfirad təriqi: hər imamın qiraətini ayrı-ayrı oxumaqdır.

7. Cəm təriqi: müəyyən bir tərtibə görə yeddi və ya on qiraəti, öz xüsusiyyətlərilə oxumaqdır.

8. Əda: Qiraəti şəxsən ustadın ağzından almaqdır. Əhli-əda da qiraəti məşayixin ağzından alan şəxsdir.

9. Ərz: Bir ustadın hüzurunda Qurani-Kərimi oxuyaraq ondan qiraət almasına deyilir.

10. İstima: Bir tələbənin, Quranı ustadını dinləyərək öyrənməsinə deyilir.

## IV. QURAN TİLAVƏTİ

### A. TİLAVƏT ŞƏKİLLƏRİ

Qiraət alimləri arasında, Quranın üç şəkildə oxuna biləcəyi qəbul edilmişdir. Bunlar sırasıyla “təhqiq, tədvir və hədr” dir. Quranın oxunuş tərzi, səsin vəziyyətinə deyil, səs Quranın qiraətinə uydurulmalıdır. İndi bu üç termini qısaca açıqlayaq.

**1.Təhqiq ( تَحْقيق )**

Təhqiq kəlmə olaraq bir şeyin haqqını artıqlaması ilə və nöqsansız yerinə gətirmək xüsusunda mübaliğə etməkdir. Qiraət alimlərinə görə; oxunan hər bir hərfin haqqını tam vermək, mədlərini lazımi şıkildə uzadmaq, hərəkələri bir-birindən ayırmaq, şəddələri tam etmək və ğunnələrin haqqını verməkdir. Təcvid qaydalarına ən son nöqtəsinə qədər diqqət etmək, haqqını verməkdir. Bu oxunuş tərzi eyni zamanda qiraət imamlarından İmam Həmzə ilə Verşin məzhəbidir.

**2. Hədr ( حدر)**

Sürətli oxumaq deməkdir. Sürət baxımından təhqiq şəklinin tam ziddidir. Quranı hədr üsulu ilə oxumaq, təcvid qaydalarını tam olaraq yerinə yetirməklə yanaşı sürəti artıraraq oxumaqdır. Mədləri, icazə verilən ən az səviyyəyə endirərək oxumaqdır.

Quranı xətm edən hafizlər və ya ramazan ayında təraveh namazı qıldıran imamlar çox vaxt bu oxunuşu tərcih edirlər. Fəqət bu oxunuşun sərhədləri yaxşı təyin edilə bilmədiyindən bir çox təcvid qaydası tərk edilməkdə, bir çox hərf də üsuluna uyğun tələffüz edilməməkdədir. Bu vəziyyət Quranı oxuyan insan üzərində böyük bir məsuliyyət meydana gətirir. Quran oxuyan hər nə qədər hədr üsulu ilə oxusa da hərflərin məxrəclərinə və təcvidə riayət edərək oxumalıdır.

**3. Tədvir (تدوير )**

Tədvir, təhqiq ilə hədr arasında bir oxunuşun adıdır**.** Bu növ oxunuşda digər iki üsuldakı rüxsətlər tərk edilərək orta bir yol təqib edilmişdir.

Bundan əlavə bir də tərtil vardır ki, o da tələsmədən dura-dura, anlaya anlaya oxumaqdır. Quran tərtil üzərə nazil olmuş və Peyğəmbər əfəndimiz (s.ə.s) də; "*Allah, Quranı nazil olunduğu kimi oxuyanı sevər*" buyuraraq bu tərz oxumağı təşviq etmişdir. Tərtil ilə təhqiq arasındakı fərq belə anladılmışdır: "təhqiq, düşünmək, təlim və məşq üçündür. Tərtil isə tədəbbür (dərin düşünmək), təfəkkür və istinbat (hökm çıxarmaq) üçündür. Hər təhqiq tərtildir, amma hər tərtil təhqiq deyildir.

**B. LƏHN (OXUNUŞ XƏTASI)**

Ləhn (لحن) lüğətda, xata etmək və doğrudan azmaq mənalarına gəlir. Təcvid elmində isə, Quran oxuma əsnasında təcvidə uymamaqdan meydana gələn xataya deyilir.

Bilindiyi kimi Qurani-Kərim təcvid üzərə nazil olmuş bir kitabdır. Onun təcvidinə uymanın hökmünü isə mövzu ilə əlaqəli başlıqlarda açıqlamışdıq. Qısaca xülasə etmək gərəkirsə, oxunuş əsnasında təcvid qaydalarına uymaq fərzdir. Bundan çıxan nəticəyə görə tam əksini düşünmək də mümkündür.

Yəni təcvidə riayətsizlik də haramdır. Belə olduğu təqdirdə Quran oxunurkən bu diqqətsizlik nəticəsində ortaya çıkan xatanın adı ləhndir.

Qiraət alimləri ləhni cəli və xəfi olmaq üzərə iki qismə ayırırlar.

1. Ləhni-cəli: Açıq xata deməkdir. Bu şəkildəki bir xatanı Quranın təcvidini geniş bir şəkildə bilənlər də, bilməyənlər görə bilərlər. Bu xata əslində hərflərin sifəti- lazimələrində meydana çıxır. Sifətlər mövzusu daha sonrakı bölmələrdə geniş bir şəkildə incələnəcəkdir. Ləhni- cəli, kəlməni təşkil edən hərflərdə və ya hərəkələrdə və yaxud da sükunda olur.

Hərfdəki xata, əksəriyyətlə bir hərfi başqa bir hərflə dəyişdirmək surətilə olur. Məsələn: ط hərfini د hərfli ilə, ص hərfini س hərfi ilə dəyişdirmək kimi. Hərfi artiqlaması ilə oxumaq ya da nöqsanlaşdırmaq da buna misal göstərilə bilər. Məsələn: Qəlqələ edərkən qəlqələ hərfini şəddəli oxuma və ya məddi tabiləri uzatmamaq kimi. Bunlar kəlmə içərisindəki hərflərdə edilən ləhni-cəlilərdir. Yəni açıq xatalardır.

Hərəkədə xata isə kəlmənin əvvəlində, ortasında və ya sonunda hərfin hərəkəsinin digər bir hərəkə ilə və ya sükunla yer dəyişdirməsidir. Edilən bu xata səbəbilə mənanın pozulup-pozulmaması vəziyyəti dəyişdirməz. Edilən xata ləhni- cəlidir.

صِرَاطَ الَّذِينَ أَنعَمتَ عَلَيهِمْ ayəsində keçən أَنعَمتَ kəlməsini أَنعَمتُ şəklində oxumaq kimi… Burada edilən hərəkə dəyişikliyi ləhni-cəlidir.

Sükunda dəyişiklik də eyni hərəkədə dəyişiklik kimidir لَمْ يَلِدْ وَلَمْ يُولَد ayəsindəki sükunları hərəkəli hala gətirmək də ləhni- cəliyə nümunədir.

لَمْ يَلِد kəlməsini لم يلدُ şəklində oxumaq kimi.

2. Ləhni-xəfi: Gizli xata deməkdir. Bu qiraət xatası hərflərin arizi sifətlərində meydana gəlir və hərfin zatını dəyişdirməz. Bu xatanı ancaq təcvid elmilə məşğul olanlar bilə bilirlər. Dolayısıyla ləhni-xəfidə məna pozulmaz.

Bunu iki qrupa ayıraraq incələmək mümkündür.

Birincisi; qiraət elmilə əlaqəsi olan hər kəsin bilə biləcəyi xatalardır. Məsələn: ixfanı, iqlabı, ğunnəni tərk etmək, qalın hərfi incə , incə hərfi də qalın okumaq kimi.

İkincisi isə; qiraət elmində olduqca məharətli olan kimsələrin anlaya biləcəyi xəfif xatalardır. Məsələn: ر hərfinin təkrarlanaraq oxunması kimi. Ya da incə oxunması lazım olan yerdə ل hərfini qalın oxumaq kimi. Bu xatalar xəfi yəni gizli və kiçik xatalar olub bunları ancaq qiraət elmini bilənlər fərq edə bilirlər.

Bunların hökümlərini qısaca belə söyləmək olar: Ləhni-cəli, qəti bir haram olduğu üçün bu haramı edənlər günah işləmiş olurlar. Bu məqsədlə təcvid öyrənmənin hökmü başlığı altında da söylədiyimiz kimi, insanı ləhni-cəlidən qurtaracaq qədər təcvid elmini öyrənmək fərzi- ayndır. Yəni hər kəsə fərzdir.

Ləhni- xəfinin birinci qismi təhrimən məkruhdur (harama yaxın məkruh). Çünki bu, şiddətli əzaba səbəb olan bir fərzi-aynın tərk edilməsi deyildir. Fəqət bunda əzab qorxusu və təhdid vardır. Quranın tilavətində bu cür xatalardan qorunacaq qədər təcvid öyrənilməsi vacibdir. Ləhni-xəfinin ikinci qisminin baş verməsi isə tənzihən məkruhdur (halala yaxın məkruh). Bu xatanı işləyənin savabı əksik olur. Bu cür xatalardan qurtulacaq qədər təcvidin öyrənilməsi isə müstəhabdır.

## C. İSTİAZƏ VƏ BƏSMƏLƏ

Hansı məqsədlə olursa olsun, Quranı oxumağa başlayan adam

"أعوذُ باللهِ مِن الشّيطَانِ الرّجِيم"

"*Qovulmuş şeytandan Allaha sığınıram"* ifadəsilə başlamalıdır. Buna "istiazə" deyilir. Allahu-Təala Quranda; *"Quran oxuduğun zaman dərhal qovulmuş şeytandan Allaha sığın"* ( ən-Nəhl, 16 / 98) buyurmaqdadır. Bu eyni zamanda Həzrət Peyğəmbər (s.ə.s) əfəndimizin sünnəsilə də sabitdir. İstiazədən məqsəd, qiraət əsnasında şeytanın vəsvəsəsini uzaqlaştırmaq olduğu üçün Allah Təala bunu əmr etmişdir. Bundan başqa da istiazə ləfizləri mövcuddur.

«أعوذ بالله من الشيطان»

«أعوذ بالله السميع العليم من الشيطان الرجيم»

«أعوذ بالله العظيم من الشيطان الرجيم»

Yuxarıda sıraladığımız bu istiazə şəkillərinin hər hansı birilə Quran oxumağa başlamaq caizdir. Bundan əlavə bu siğələr mötəbər hədis alimləri Nəsəi, Tirmizi, Əbu Davud və İbni-Macə tərəfindən rəvayət edilmişdir. Ancaq kitab və sünnəyə uygunluğu səbəbilə Quranın seçmiş olduğu istiazə siğəsi «أعوذُ باللهِ مِن الشّيطانِ الرّجِيم» dir.

İstiazənin hökmünə vacib deyənlər olmaqla birlikdə, sünnə və ya müstəhab deyənlər də olmuşdur. Quran oxumağa başlayan şəxs istər bir surənin başından, istərsə də ortasından oxusun, istiazə ilə başlamalıdır. İstiazənin əsl yeri isə qiraətdən öncədir. Çünki istiazə Allaha sığınmaq deməkdir. Beləliklə Quran oxuyacaq kimsə Allah kəlamını oxumağa hazır hala gəlir.

Quran oxuyan kimsə qiraətini, qiraətlə əlaqəli bir səbəblə qısa bir zaman üçün kəsmək məcburiyyətində qalarsa, daha sonra təkrar başladığında yenidən istiazəni təkrarlamaz. Məsələn: Oxuyan, Quranın əhkamı, təcvidi və ya təfsirini düşünmək surətilə, ya da öskürmək, asqırmaq kimi məcburi bir özür səbəbilə oxumağa ara verdiyi taqdirdə istiazəni təkrarlamaz, amma oxunuşu kəsmə qiraətlə əlaqəli bir səbəbdən deyilsə oxuyan istiazəni təkrar etməlidir.

Bəsmələnin ləfzi بِسْمِ اللّٰهِ الرَّحْمَنِ الرَّحِيم şəklində olub mənası da *"Rəhman və Rəhim olan Allahın adıyla"* deməkdir. Bəsmələ tövbə surəsi xaric digər bütün surələrin başında mövcuddur. Çünki tövbə surəsinin ayrı bir surə olub olmadığı və ya Ənfəl surəsinin davamı olduğu mövzusu sahabei-kiram arasında ixtilaflıdır. Bu surənin nüzülü əsnasında Həzrət Peyğəmbər (s.ə.s) əfəndimiz bəsmələ yazılmasını əmr etməmişdir.

Sad b. Cübeyr, Zühri və İmam Şafii kimi alimlər, bəsmələnin, başında olduğu hər surədən bir ayə olduğu görüşündədirlər. Bu səbəblə də bəsmələni namazlarda səsli bir şəkildə oxuyurlar. İmamı-Azama görə isə surələrin başında yer alan bəsmələ öz-özünə bir ayədir və Qurandandır. Surələrin aralarını ayırmaq və başlanğıcda təbərrük olunmaq üçün nazil olmuşdur. Fəqət bu bəsmələlərin, başında olduğu surələrdən bir cüz olduğuna aid də açıq bir dəlil tapılmamısdır. Dolayısıyla bəsmələ digər bütün surələrdən ayrı və müstəqil bir ayədir və hər namazda oxunması vacib deyildir. Fəqət gərək namazda, gərəksə də Quran oxumağa başlarkən oxunması sünnədir. Bu səbəblə də namazda qiraətin başında oxuyuruq, ancaq ortasında oxumuruq.

Fatihə surəsini və ondan sonra oxuduğumuz surəni səsli (açıqdan) oxuyuruq. Ancaq bəsmələnin bunlardan bir cüz olduğu anlaşılmasın deyə onu gizli oxuyuruq. Bütün Hənəfi alimləri bu mövzuda müttəfiqdir.

Bütün qiraət alimləri Tövbə surəsi xaric digər bütün surələrin başında bəsmələ olduğu mövzusunda ittifaq etmişdirlər. Dolayısıyla Tövbə xaric hansı surə olursa olsun, bəsmələ ilə başlanmalıdır. Hər hansı bir surənin əvvəlindən deyil, başqa bir yerindən oxunmağa başlanılırsa oxuyan, bəsmələ çəkib çəkməmədə müxəyyərdir (sərbəsdir). Hər ikisi də caizdir. Bu bütün məzhəplərin görüşüdür. Bu anlatdıqlarımızdan ortaya çıxan nəticə budur: İnsan Quran oxumağa başlarkən qətiyyətlə istiazə və bəsmələ ilə başlamalıdır. Yəni, «أعوذُ باللهِ مِن الشّيطَانِ الرّجِيم / بِسْمِ اللّهِ الرَّحْمَـنِ الرَّحِيم» deməlidir. Quran oxumağı bitirəcəyi zaman da;«صَدَقَ الله العَظِيم» şəklində bitirməlidir.

**1.Surə əvvəlində və iki surə arasındakı vəcihlər (dəyişik oxunuşlar)**

Təcvid qanun-qaydalarını yazmağa başlamadan öncə, istiazə və bəsmələ mövzularıyla əlaqəli olaraq, Quran oxumağa başlarkən ya da bir surəni bitirib digərinə keçərkən necə oxunacağını və ya nə şəkildə keçiş ediləcəyini bildirməyimiz faydalı olacaqdır. Çünki bu xüsusda bir neçə dəyişik oxuma şəkli olub hamısı da səhihdir. Bunları maddələr halında xülasə edək.

**a. Surə əvvəlindəki vəcihlər**

Tövbə surəsinin əvvəli xaric, digər surələrin əvvəlində, bütün Qiraət imamları və raviləri ittifaqla birlikdə dörd vəcih edərlər. Quran oxuyanın bunları bilməsi və bu vəcihlərə görə hərəkət etməsi lazımdır.

1. Həm istiazənin, həm də bəsmələnin sonunda durub (vəqf edib) surəyə o şəkildə başlamaq. (qəti-küll)

2. itiazənin sonunda durub, bəsmələnin sonunda vəsl edərək (keçərək) surəyə başlamaq. (qəti-əvvəl, vəsli-səni)

3. İstiazənin sonunda vəsl edib, bəsmələnin sonunda vəqf edərək surəyə başlamaq. ( Vəsli-əvvəl, qəti-səni)

4. Həm istiazənin həm də bəsmələnin sonunda durmayıb surəyə başlamaq. (vəsli-küll)

İstiazə və bəsmələylə birlikdə Fatihə surəsinə başlamaq istədiyimizdə yuxarıda verdiyimiz dörd vəcihi qiraət elminə uyğun ifadələrlə bu şəkildə göstərə bilərik.

اعوذ .....................بسمله....................الحمد لله

1. ـــــ قطع ـــــ قطع ـــــــ قطع كل

2. ـــــ قطع ـــــ وصل ـــــــ قطع اول وصل ثاني

3. ـــــ وصل ـــــ قطع ـــــــ وصل اول قطع ثاني

4. ـــــ وصل ـــــ وصل ـــــــ وصل كل

**b. İki surə arasında vəcihlər**

Ənfəl surəsi ilə tövbə surəsi arası xaric, geri qalan surələrin bir öncəkindən bir sonrakına keçiş edəcəyimiz zaman caiz olan beş vəcihdən birini etməliyik. Bu beş vəcihdən üçü bütün qiraət alimlərinin ittifaq ətdiyi, digər ikisi də bəzı qiraət alimlərinin və ravilərinin tərcih ətdiyi vəcihlərdir. İki surə arasında qiraət imamlarının və ravilərinin ittifaqla qəbul etdikləri üç vəcih belədir.

1. Həm birinci surənin sonunda, həm də bəsmələnin sonunda duraraq ikinci surəyə başlamaq.

2. Birinci surənin sonunda durub, bəsmələnin sonunda durmadan keçərək, ikinci surəyə başlamaq.

3. Həm birinci surənin sonunda, həm də bəsmələnin sonunda durmayaraq, ikinci surəyə başlamaq.

Bu maddələri nümunə olması üçün Fatihə surəsinin sonundan Bəqərə surəsinə keçərkən belə göstərə bilərik.

ولا الضالين ..............بسمله....................الم

1ـــــ قطع ـــــ قطع ـــــــ قطع كل

2 ـــــ قطع ـــــ وصل ـــــــ قطع اول وصل ثاني

3 ــ وصل ـــــ وصل ـــــــ وصل كل

Bunlar bütün qiraət imamlarının üzərində ittifaq etdikləri vəcihlərdir. Görüldüyü üzərə bunlar arasında –xüsusilə də ikinci maddə ilə əlaqəli olaraq-

birinci surənin sonunda durmayaraq birbaşa bəsmələyə keçmək və sonra bəsmələnin sonunda duraraq digər surəyə başlamaq kimi bir maddə yoxdur. Çünki belə bir halda bəsmələ, öncəki surənin sonuna əlavə edilmiş bir ayə kimi başa düşülə bilər. Bu səbəbə görə qiraət imamlarının ittifaq etdikləri və etmədikləri vəcihlər içərisində belə bir vəcih yoxdur.

Yukarıdakı üç maddəyə əlavə olaraq iki surə arasındakı oxunuş şəkillərinə iki vəcih də əlavə edilib. Bunlar bəzi qiraət alimləri tərəfindən oxunmuşdur. Bu səbəbdən üzərlərində bir ittifaq yoxdur. Quran tələbəsi tərəfindən bilinməsi lazım olduğu üçün bu iki vəcihi də burada zikr etmək istəyirik.

1. Birinci surənin sonunda səktə edib (nəfəs almadan səsi kəsib) bəsmələ oxumadan ikinci surəyə başlamaq. Buna, "*səktə bilə bəsmələ"* deyilir. Səktə bilə bəsmələni qiraət imamlarından Verş, Əbu Amr, İbni- Amir və Şeyx Yaqub oxuyurlar.

2. Birinci surənin sonunda durmayaraq və bəsmələni tərk edərək ikinci surənin əvvəlinə başlamaq. Bu şəkildə bir oxunuşa "*vəsl bilə bəsmələ"* deyilir. Bu iki maddə, Quranı oxuyan hər kəsin bilməsi gərəkən mövzular olmadığı üçün ətraflı bəhs etmirik.

# İKİNCİ BÖLMƏ

## I. TƏCVİD ELMİ

### A.TƏCVİD ELMİNİN TƏRİFİ

Təfil vəznində ج و د maddəsindən bir məsdər olan təcvid kəlməsi, lüğətdə "bir şeyi gözəl etmək, bəzəmək" mənalarına gəlir. Temrin olaraq da bir-birindən o qədər də çox fərqli olmayan təriflər verilmişdir.

Bunlardan birincisi qiraət alimi olan İbnül-Cəzərinin (ö. 833/1429) tərifidir. Ona görə təcvid elmi;

"اِعطاءُ الحروفِ حقُوقها وترتيبُ مراتِبِها وردّ الحرفِ الى مخرجِه واصلِ"

*"Təcvid; hərflərin haqqını vermək, mərtəbələrini tərtib etmək, hərfi məxrəcinə və aslinə əsaslandırmaqdır."*

Zəkəriyyə əl-Ənsəri (ö. 926/1520) isə təcvidi; *"hər bir hərfin məxrəc və sifətini yerinə gətirmək surətilə Quranı tilavət etmək"* olaraq tərif etmişdir.

Katib Çələbiyə (ö. 1081/1670) görə təcvid; "*Quranın tilavətini, hərflərin məxrəcləri ilə sifətləri yönündən gözəlləşdirmədən və hər hərfə aid vəsl, vəqf, mədd, qəsr… kimi xüsusların haqqını vermək surətilə nəzmi- mübinin (Quranın) tərtilindən bəhs edən bir elmdir"*.

Bu təriləri tam əhatə edəcək şəkildə təcvid elmini bu şəkildə xülasə edə bilərik: Təcvid, hərflərin məxrəc və sifətlərinə uymaq surətilə, Qurani-Kərimi xatasız oxumağı öyrədən bir elmdir.

Bu ifadələrdən də anlaşılacağı üzərə təcvid elmi, Qurani-Kərimi oxuyan kimsədə bir xasiyyət, qüvvət və bir vərdiş meydana gətirir. Bu vərdişlər sayəsində də müəyyən qaydalara tabe olunmaq surətilə Qurani-Kərim, Həzrət Peyğəmbər (s.ə.s) əfəndimizə vəhy olunduğu şəkli ilə oxunur.

Təcvid elmi, qiraət elmilə çox zaman qarışdırılır. Hətta bəzi alimlər təcvid elmini qiraət elminin bir parçası saymışlarsa da, mövzusu və əhəmiyyətinə görə qiraət elmi ayrı bir elm olaraq mütaliə edilmişdir. Qiraət elmi və alimlərilə əlaqəli geniş məlumat daha sonra veriləcəkdir.

Qiraət elmi, Quranın kəlmələrinin ədalarındakı keyfiyyət və ixtilafları, bunları nəql edənlərə isnad edərək bilməkdir. Mövzusu isə Quranın kəlmələridir. Təcvid elmi isə hərflərin sifətlərinin mahiyyətini bilməkdir. Bu fərqlilik  iki elmi bir-birindən ayırır.

## B. TƏCVİD ELMİNİN MÖVZUSU VƏ MƏQSƏDİ

Təcvid elminin mövzusu Quran və Quranın kəlmələridir. Burada Quranın kəlmələrindən məqsəd, bu kəlmələrin hərfləridir. Təcvid elmi, kəlmələri meydana gətirən hərfləri öncə tək-tək ələ alaraq onların məxrəclərini və sifətlərini incələyir. Daha sonra da bu hərflərin bir-birilə meydana gətirdiyi kəlmələrdəki mədləri, qəsrləri (uzatma və qısaltmaları) göstərərək vəqf və vəsl (durmaq və keçmək) kimi xüsusları da ortaya qoyur. Bu məsələlər daha sonra ətraflı şəkildə açıqlanacaqdır.

Gərək ayələrdə gərəksə də Həzrət Peyğəmbər (s.ə.s) Əfəndimizin hədislərində Quranı təcvid ilə oxumağımız mövzusunda bəzi əmrlər mövcuddur. Quranı təcvid ilə oxumaq Həzrət Peyğəmbər (s.ə.s) Əfəndimizə endirildiyi şəklilə oxumaq deməkdir. Quranı oxuyarkən  dilin xatadan qorunması, oxuyanların da dünya və axirət məsuliyyətindən qurtulması bu elmin əsl məqsədidir.

Təcvid, Qurani-Kərimin oxunmasına aid lazım gələn üsul və qaydaları öyrədir. Bu üsullara görə hər hərfi doğru bir şəkildə tələffüz etmək, səsli

hərfləri lazımi qədər uzatmaq (məd), lazım gələn yerdə durmaq (vəqf), səsləri bir-birinə daxil etmək (idğam) və ya kəsmək (səktə), titrətmək (qəlqələ) və ayırmaq (izhar) kimi mövzuları əhatə edən qaydalardan bəhs edən təcvid elminin əsl məqsədi, Allahın kəlamı olan Quranı xatasız və düzgün oxumağı təmin etməkdir.

## C. TƏCVİDİN HÖKMÜ

Qurani-Kərim, müəyyən qanun və qaydalara tabe olunmadan oxunacaq bir kitab deyildir. Quran oxuma iddiasında olan hər müsəlman, təcvid qaydalarına uymaq məcburiyyətindədir. Ayə və hədislərdə təcvidə riayət edilməsi əmr edilmiş, İslam alimləri də bu mövzuda bir çox hökm qoymuşdur. Belə ki, əl-Müzzəmmil surəsinin dördüncü ayəsində; "*Quranı açıq- açıq (aram-aram) tərtil ilə oxu"* buyurularaq təcvidə işarə edilmişdir. Bu ayəti kərimə Həzrət Əliyə soruşulduğu zaman O, *"tərtil, hərfləri təcvidlə yəni lazım və ariz sifətlərilə oxumaq və vəqfləri bilməkdir"* demişdir.

Böyük qiraət alimi İbnül-Cəzəri də təcvidi öyrənmənin qəti bir fərz olduğunu bildirərək Quranı təcvidsiz oxuyanın günahkar olacağını söyləmişdir. Bu halda təcvid elmini bilmək fərzi-kifayə, ancaq onunla əməl etmək hər müsəlmana fərzi- ayndır. Digər bir ifadə ilə; böyük və açıq xatalardan qorunacaq qədər təcvid bilgisinə sahib olmaq hər müsəlman üçün fərzdir. Ancaq bu elmin incəliklərini geniş şəkildə öyrənmək isə fərzi- kifayədir.

## Ç. TƏCVİD ELMİNİ ƏLDƏ ETMƏNİN YOLLARI

Təcvid elmi həm nəzəri, həm də tətbiqi bir elmdir. Hər elmin bir öyrədiciyə ehtiyacı vardır. Təcvid elminin isə öyrədiciyə olan ehtiyacı digər bütün elmlərə nəzərən daha çoxdur. Hər nə qədər insan, bu elmin nəzəri yönünü tək başına öyrənə bilsə də, tətbiqi yönünü tək başına əsla öyrənə bilməz. Bu elmdə əsas olan, təcvidin tətbiq edilməsini kamil bir ustadın ağzından almaqdır. Necəki təcvid kitablarında keçən "خُذُوه من افواه المَشَايخ" "*Bunu ustadların ağzından alınız*" ifadəsi də bunun əhəmiyyətini bir daha göstərir. Bu elmdə əsas olan, bu elmin həm qanun və qaydalarını öyrənmək, həm də bu qaydaları haqqıyla tətbiq edə bilən bir ustaddan tətbiqatını əldə etməkdir.

## II. HƏRFLƏR. MƏXRƏCLƏRİ VƏ SİFƏTLƏRİ

### A. HƏRFLƏRİN TƏRİFİ VƏ TƏQSİMİ (QİSMLƏRİ)

Hərf lüğətdə الطرف *"tərəf"* yəni bir şeyin ucuna, kənarına və sivri, kəskin küncünə deyilir. Hərflər, kəlmələrin müəyyən yerlərində olamaları səbəbilə belə bir ifadə ilə tərif edilmişdir.

"ومِن الناسِ مَن يعبد على حرفٍ"

"*İnsanlardan bəziləri də Allaha yalnız bir tərəfindən ibadət edər"*. ( əl-Hacc, 2) ayəsindəki hərf kəlməsi də bu mənadadır.

İnsan, yaradılışı etibarilə nəfəs alır və verir. Bu nəfəs iradə qüvvətilə çıxar və eşidilərsə səs olur. Əgər bu səs məxrəclərin birindən çıxarsa buna hərf deyilir. Məxrəc isə hərflərin çıxış yerlərinə verilən isimdir. Hər hərfin özünə xas bir çıxış yeri mövcuddur və Quran oxuyan şəxs, hərfləri müəyyən edilmiş məxrəclərindən çıxarmaq məcburiyyətindədir. Qurani-Kərimi oxumaq istəyən hər kəs üzərinə, hərflərin məxrəc və sifətlərini bilmək lazımi və dini bir məcburiyyətdir ki, Quran kəlmələrini, mənanı tam ifadə edəcək bir şəkildə tələffüz edə bilsinlər. Bu müəyyən məxrəc və buna bağlı olaraq da hərflərin sifətlərini bir sonrakı başlıqda izah edəcəyik.

Hərflərin tərtibində bir-birindən fərqli metodlardan istifadə edilmişdir. Dilçilər, qiraət alimləri və riyaziyyatçılar ərəb dilindəki hərfləri fərqli-fərqli tasnif etmişdirlər. Mövzumuz baxımında biz dilçilərin və qiraət alimlərinin təsniflərinə nəzər salacayıq.

Dilçilərin hərf təsnifləri, eyni zamanda günümüzdə ərəb əlifbasını meydana gətirən şəkildə sıralanır:

ا ب ت ث ج ح خ د ذ ر ز س ش ص ض ط ظ ع غ ف ق ك ل م ن و ه لا ي

Qiraət alimləri isə hərfləri, məxrəcləri yəni çıxış yerləri etibarilə təsnif etmişlər.

1. Boğaz Hərfləri (ء هـ ع ح خ غ - ---- -------------(الحُرُوف الْحَلْقِيَّة)
2. Kiçik dil (dilçək) hərfləri (ق ك-------------------(الحُرُوف الهوية)
3. Çənə ortası hərfləri (ج ش ى ض-------------------(الحُرُوف الشَّجَرِيَّة)

4. Dil ucu hərfləri (ز س ص-------------------------(الحرُوف اللِّسَانِيَّة)

5. Üst damaq hərfləri (ت د ط----------------------(الحرُوف النطعية)

6. Diş əti hərfləri (ث ذ ظ----------------------------(الحرُوف اللَّثَوِيَّة)

7. Dil ucu hərfləri (ن ل ر------------------------------(الحرُوف الذَّلَقِيَّة)

8. Dodaq hərfləri (و ب م ف-------------------------(الحرُوف الشَّفَوِيَّة)

9. Hava (cəvf) hərfləri (ي ا و---------------------(الحرُوف الجَوْفِيَّة)

**1. Hərflərin məxrəcləri**

Lüğətdə "çıxış yeri, qaynaq" mənasına gəlir. Yuxarıda da ifadə etdiyimiz kimi təcvid elmində "hərfin çıxdığı və başqa hərflərdən ayrıldığı yerə" deyilir. Hərfləri bir-birindən ayıran ya məxrəclərdir ya da sifətlər. Məxrəc və sifətlərin tamamı yönündən eyni olan iki hərf düşünülə bilməz. Hərflərin qüvvətli olanı zəifindən, səsli olanı səssizindən, məxrəcləri eyni olan hərflərin bir-birlərindən ayrılmaları, sifətləri yolu ilə bilinir.

Qurani-Kərim hərflərinin məxrəcləri (ağız və boğazda çıxdıqları yerlər) 17 dir.

1.Ağızda havanın öz-özündən girib-çıxdığı yerdir ki, hərfi-məddin) (و ى ا) məxrəcidir. Bu qəsd etdiyimiz məxrəcin adı cəvf (جوف) dir. Burada diqqət edilməsi lazım olan xüsus, mötərizə içində yazdığımız hərflərin şəxsən özləri deyil, mədd hərfi olduqları zamanki hallarıdır. Yəni məqəbli (öncəsi) ötrəli olan sakin vav, məqəbli kəsrəli olan sakin yə, və əlifdir. Əlif ( ا ) ilə həmzəni ( أ ) bir-birindən ayırd etmək lazımdır. Çünki həmzə boğaz hərfi, əlif isə cəvf hərfidir. Bundan əlavə əlif, hərəkəni qəbul etmədiyi halda, həmzə qəbul edir. Bütün bunlar aralarındaki fərqi göstərir.

2. Boğazın köksə bitişik yerindən ya da boğazın nəhayətindən (أ هـ) çıxar.

3. Boğazın ortasından (ح ع ) çıxar.

4. Boğazın dilə bitişik yerindən (خ غ ) çıxar.

5. Dilin boğaza bitişik yerindən və onun üstü ilə bərabər (ق) çıxar.

6. (ق) məxrəcinin bir barmaq aşağısından (ك) çıxar.[6]

7. (ك) məxrəcinin aşağısından və dilin ortasından (ج ش ى) çıxar.

8. Dilin iki yanından birinin (sol və ya sağ) acı dişi ilə daha gerisindəkilərə xəfifcə dəyməsilə (ض) çıxar.[7]

9. Dilin (ön) tərəfinin üst damaqdakı dəhik (acı), nəb (köpək dişləri), rəbaiyyə (öndəki dörd diş) və səniyyə (ön) dişlərinə dəyməsilə (ل) çıxar.

10. Dil ucunun üst ön dişlərinin ətlərinə dəyməsilə (ن) çıxar.

11. (ن) məxrəcinin biraz arxasından (ر) çıxar.

12. Dil ucu ilə üst ön dişlərinin yarısından yuxarısından (nisfi-əlasından) ( ط د ت ) çıxar.

13. Dil ucu ilə üst ön dişlərinin yarısı yuxarısından ( ص س ز )çıxar.

14. Dil ucunun üst üzü ilə üst ön dişlərinin başlarından (ظ ث) çıxar.

15. Üst ön dişlərinin başları ilə alt dodağın üçündən (ف) çıxar.

16. Dodaq məxrəcidir. Dodaqların sıx qapanmasıyla (ب)xəfif qapanmasıyla (م), qapanmadan bir-birinə yaxınlaşdırılmasıyla (zəmm edilməsilə) (و) çıxar.

17. Xəyşüm; yəni gəniz boşluğudur. Buradan idğam və ixfa olan (ن) çıxar.

Bu cədvəl diqqətlə oxunduqdan sonra görüləcəkdir ki, Qurani-Kərim hərfləri, üç bölgədən (boğaz, ağız, dodaq) çıxır. Dördüncü bölgə sayılan gəniz boşluğundan isə həqiqi (əsl) bir hərf deyil, (ن) hərfinin ğünnə sifəti çıxır. Birinci məxrəcdən məd hərflərinin ) و ى) ا on yeddinci məxrəcdən isə idğam və ixfa halındakı (ن) un çıxması nəticəsində 28 əsl hərfin 15 məxrəcdən

[6] Məxaric-i hürüfun sayılmasına boğazın nəhayətindən başlandığı üçün "aşağısı" ifadəsi boğazdan dodaqlara doğru olan istiqaməti gösdərir. Bundan fiziki duruşumuzdaki aşağı-yuxarı ox anlaşılmamalıdır.

[7] Dişlərin cədvəli daha sonra veriləcəkdir.

çıxdığı görünür.[8] Ağız bölgəsindən çıxan hərflərin bəziləri dişlərlə yaxından əlaqəli olduğundan, dişlərin də tanınması lazımdır.



| | |
|---|---|
| 1. səniyyə (ön) (cəmi: sənəyə) | 4 ədəd |
| 2. rəbaiyyə (cəmi: rəbaiyyat) | 4 ədəd |
| 3. nəb (cəmi: ənyəb) | 4 ədəd |
| 4. dəhik (acı) (cəmi: dəvahik) | 4 ədəd |
| 5. Təhin (cəmi; təvahin) | 12 ədəd |
| 6. Təhin (cəmi; təvahin) | 12 ədəd |
| 7. Təhin (cəmi: təvahin) | 12 ədəd |
| 8. Səniyyə (cəmi: sənəyə) | 4 ədəd |

Bu cədvəl ağzın ¼ idir. Yəni bir damağın yarısıdır. Burada tək isimlə keçən dişdən ağızda dört dənə var deməkdir (səniyyə, rəbaiyyə, nəb, dəhik,). Tahinlərdən isə ağzın tamamında 12 dənə vardır. Bundan əlavə dişlərin kəsici hissələrinə "dirs" deyilir. Cəmi "ədrəs"dir.

## 2. Hərflərin sifətləri

Təcvid elmində sifət, məxrəcdə meydana gəlişi əsnasında hərfin səsinə ərz edilən keyfiyyətə deyilir. Məxrəcləri bir olan hərflərin bir-birindən ayırd edilə bilmələri sifətləri ilə mümkün olur. Sifətləri bilmənin iki mühim faydası vardır.

1. Məxrəcləri eyni olan hərflərin bir-birindən ayırd edilmələrini təmin edir. Məsələn: məxrəcləri bir olan ط ilə د hərfləri bir-birindən ancaq sifətlərinin fərqli oluşu səbəbilə ayırd edilir.

2. Hərflərin qüvvətlisinin, zəyifindən ayırd edilməsinə kömək göstərir.

---

[8] Məxrəc cədvəlindəki birinci məxrəcdən hərfi-mədlər ) ى و) ا çıxar. Yeddinci məxrəcdən çıxan (ى) ilə on altıncı məxrəcdən çıxan (28 (و hərf silsiləsindəndir. (ن) hərfinin də iki dəfə zikredilməsinə çaşmamaq lazımdır. 28 hərf silsiləsinə daxil olan (10- (نcu məxrəcdən çıxar.17-ci məxrəc isə (ن) un özünün deyil, ğünnə sifətinin məxrəcidir.

Beləcə -daha irəlidə də açıqlayacağımız üzərə- hansı hərfin hansına idğam ediləcəyi ancaq bu xüsus ilə ortaya çıxır. Sifətlər ümumi mənada əsli (lazımi) və arizi olaraq iki qismə ayrılırlar.

a. Sifəti-Lazimə: Bunlara sifəti-zatiyyə də deyilir. Bu sifətlər hərflərin zatına məxsus olub onlardan əsla ayrılmazlar. Əgər sifəti-lazimələr dəyişdirilər ya da tərk edilərsə, meydana gələn xata "ləhni-cəli" yəni böyük xata olmuş olar.

**Sifəti-lazimələr bunlardır:**

| | |
|---|---|
| Həms | هَمْس |
| Cəhr | جَهْر |
| Şiddət | شَدَّة |
| Rixvət | رَخْوَة |
| Beyniyyə | بَيْنَة |
| İstila | استعلاء |
| Qəlqələ | قَلْقَلَة |
| Safir | صفير |
| Təkrir | تَكْرَير |
| İstitalə | اَسْتَطَالَة |
| Təfəşşi | تَفَشِّي |
| Ğünnə | الغنة |
| Itbaq | الاطباق |
| İnfitah | انفتاح |

b. Sifəti-Arizə: hərfdən ayrılması mümkün olan və ayrıldıqları zaman da hərfin zatını dəyişdirməyən sifətlərdir. Hərfin zatında bir dəyişiklik meydana gəlmədiyi üçün bu sifətlərin tərkində, təğyirində (dəyişdirilməsində) və ya təbdilində ləhni-xəfi dediyimiz kiçik xata meydana gəlir. Bu sifətlari yuxarıda olduğu kimi bu şəkildə sıralaya bilərik:

| | |
|---|---|
| Təfxim | التفخيم |
| Tərqiq | الترقيق |
| İdğam | الاطغام |
| İxfa | الاخفاء |
| İzhar | الاظهار |
| Qəlb | القلب |
| Mədd | المد |
| Vəqf | الوقف |
| Səktə | السكت |
| Hərəkə | الحركة |
| Sükun | السكون |

Yuxarıda saydığımız bəzi terminləri, öz mövzusunda incələyəcəyik. İmdi lazımi sifətləri qısaca açıqlayaraq hərflərin hansı qrupa girdiyini göstərək.

**Həms** ( هَمْس ) : Gizli deməkdir. Hərf tələffüz edilərkən məxrəcinə zəyif toxunduğundan nəfəs çölə axar. Həms sifətinin hərfləri 10 dur. فَحَثَّهُ شَخْصٌ سَكَتْ şəklində göstərilir.

**Cəhr** ( جَهْر ) : Aşkar deməkdir. Həmsin tam ziddidir. Beləcə 28 hərfin 10u gizli, 18i isə aşkar olduğu ortaya çıxmış oldu. Bu hərfləri bir daha yazmaq gərəkirsə; ا ب ج د ذ ر ز ض ط ظ ع غ ق ل م ن و ي şəklində ifadə edə bilərik.

**Şiddət** ( شِدَّة ): Şiddətli deməktir. Hərf tələffüz edilərkən səsin məxrəcə həbs olması və məxrəcdə qüvvətli dayanmasındandır. Başqa bir ifadə ilə, qüvvətli səs və çətin söyləmə halıdır. Cəmi 8 hərfdir أَجِدْ قَطٍ بَكَتْ

**Rixvət** ( رِخْوَة ) : Yumuşaq deməkdir. Səsin hərflə bərabər axmasıdır. Bunun da səbəbi rixvə hərfinin oxunarkən məxrəcdə zəyif dayanmasıdır. Rixvət sifəti asanlıqdır. Rahat tələffüz edilir. Rixvət hərfləri 15 dənədir:

ث ح خ ذ ز س ش ل ص ض ظ غ ف هـ ى

**Beyniyyə** ( بَيْنَةَ ) : Şiddətlə yumuşaqlıq arası deməkdir. Yəni hərf tələffüz edilərkən səs şiddətlə həbs olmadığı kimi nəfəsin yumuşaqlıq meydana gətirəcək şəkildə cərəyan etməsidir. Hərfləri 5 dir. لِنْ عُمَر [9]

**İstila** (استعلاء ) : Yüksəlmək deməkdir. Yəni hərf oxunarkən dilin üst çənə tərəfinə qalxmasıdır. Eyni zamanda bu hərflərə hürufu müstəliyə də deyilir. Hərfləri 7dir: خُصَّ ضَغْطٍ قِظ

**İstifalə** (استفالة): Lisanın alçalması deməkdir. Hərf oxunarkən dil ağzın düzlüyü səviyyəsinə alçalır. Hərfləri 21dir. (Müstəliyə hərflərinin xaricində qalan hərflərdir.)[10]

**Itbaq** ( الاطباق ) : Səsin ağız qübbəsinə vurulması. Hərf oxunarkən dil, üst damaq tərəfinə qalxması, dolayısıyla səsin ağzın qübbəsinə vurmasıdır (Yəni dil kökündən geri çəkilmiş şəkildə qüvvətlə basılmalı və dil bükülərək qatlanmasıdır.) Hərfləri dörddür: (ص ض ط ظ)

**İnfitah** ( الانفتاح) : Səsin düz olması. Hərfləri (itbəq hərflərinin xaricində qalan 24 hərfdir. Bu hərflər oxunarkən, dil və üst çənənin bir-birindən ayrılması, dolayısıyla hərfin səsinin düz olmasıdır. (İtbəqdəki qübbəyə vurmanın ziddidir).

**İzləq** (الاذلاق) : Lisanın asan sürüşməsi mənasına gəlir. Bunınla yanaşı bunlara müzəlqa hərfləri də deyilir. Müzləqa hərfləri olan (فِرَّ مَنْ لُبّ) dən (ر ل ن) da dilin uc tərəfinə, (ف م ب) də isə dodaqların uclarına etimad edilir. Müzləqa hərfləri xəfif olduqları üçün lisan bu hərflərdən asan sürüşdüyünə görə özlərinə bu isim verilmişdir.[11]

**İsmət** ( الاصمات) : Lisanın tutulması. Müzləqa hərflərinin xaricində qalan 22 hərfə bu ismin verilməsi lisanın, bu hərfləri tutula-tutula oxumasındandır. Ümumi olaraq ifadə edərsək; ismət hərfləri ağır, izləq hərfləri isə xəfifdir.

---

[9] Bir-birinə zid olan şiddət ilə rixvənin yanında beyniyyə sifəti vardır. Hər hansı bir hərfin bu qrupda sifəti axtarıldığı zaman şiddətdə olmayan beyniyyədə axtarılır, orda da yoxsa rixvədədir.

[10] İstifalə, dilin öz halını buraxılmasıdır. İstila isə dilin üst damağa yüksəlməsidir. Bu iki halda dil bükülmədiyi üçün, istila və istifalə hərfləri itbəqin ziddi olaraq infitah sifətində birləşirlər.

[11] Ərəbcədə rübai, xüması, südasi kəlimələrdə izləq hərflərindən birinin olması kəlimənin tələffüzünü asanlaşdırır.

Misal. ( حَصْحَصَ ) kimi. Bu hərflərə hüruful-Məsmətə də deyilir.

Buraya qədər edilən izahlar hərflərin bir-birinə zid olan sifəti-lazimələrinə aid idi. İndi isə hərflərin ziddi olmayan sifəti- lazimələrinə başlayaq.

**Safir** (صَفِير ) : Fit səsi deməkdir. Quş uçarkən çıxan səs safir hərflərindən çıxan səsə bənzər. Hərfləri yuxarıda qeyd etdiyimiz 13-cü məxrəcin hərfləri olan (ز ص س) dir.

**Qəlqələ** (قَلْقَلَة) : Hərf oxunarkən məxrəcin tərpənməsi deməkdir. Hərfləri 5 dənədir. (قُطْبُ جَدٍ) Hər nə qədər "məxrəcin tərpənməsi" deyilmiş olsa da, təlim-tərbiyə baxımından "məxrəcdə hərfin səsinin tərpənməsi" demək daha uyğundur. Qəlqələ hərflərində cəhr və şiddət eyni anda meydana gəlir. Buna görə də bu hərflərin sükun ilə oxunuşlarında səs və nəfəs tamamən qapanır. Fəqət bu vəziyyət, qəlqələ hərflərinin əsas səsinin ortaya çıxmasına mane olduğundan, duruş anında ağızda həbs olan səsin qüvvətlə ortaya çıxması lazımdır. Budur ki, əda əhlinə görə sonradan ortaya çıxan zaid səsə qəlqələ deyilir. Bu mövzu daha sonra ətraflı bir şəkildə izah ediləcəkdir.

**Lin** (لِين) : Yumuşaq deməkdir. Üstündən sonra gələn sakin Vav ilə Yə hərflərini mülayim yəni yumuşaq oxumaqdır. Hərfləri əvvəli məftuh (fəthəli) olan sakin Vav ilə Yə dir. (ـَوْ ـَيْ)

**İnhiraf** (اِنْحِرَاف) : Lisanın önə meyl etməsidir. Hərfləri ikidir. (ل ر) Bu hərflər oxunarkən dilin ucuna meyl edərlər. Bu hərflər dilin yarıdan yuxarısı tərəfindən çıxarlar.

**Təkrir** (تَكْرِير) : Təkrar deməkdir. Hərfi (ر) dır. Bu hərfdə təkrarlılıq vardır. Ancaq bu təkrarlılıq hərfin ani olaraq oxunmasındadır. Çünki (ر) ani tələffüz edilən hərflərdəndir. Bu sifət (ر) hərfinin bu ölçüdəki həddini müəyyən etməsilə birlikdə, açıq təkrarlarla daha uzun bir zamanda oxuna bilinməyəcəyini də nəzarət altına alır. Yəni, tələffüz edilmə müddəti nə çox nə də az olmalı; təqribən bir hərf zamanı qədər müddətdə oxunmalıdır.

**Təfəşşi** (تَفَشِّي) : Fısıltı və yayılmaq mənasına gəlir. Hərfi ش dir. Bu hərf oxunarkən ağızdan çıxan rüzgarın yayılmasıdır. Yəni bu hərfin uzanmasıdır.

**İstitalə** (اِسْتِطَالَة) : Uzun olmaqdır. Bu sifət (ض) hərfinin tələffüzu əsnasında dilin məxrəcə yerləşməsi üçün zəruri olaraq keçməsi lazım olan

müddəti ifadə edir. Məlumdur ki, (ض) hərfi ədras dişləri (kəskin dişlər) və dilin iki yanından biri (sol və ya sağ)[12] ilə çıxarkən yarım əlif miqdarı bir uzadma meydana gəlir. Yəni, dil (ض) hərfinin məxrəcinə bəlli bir zamanda yaxınlaşar. Bu vəziyyətə istitalə deyilir.

**Təfxim (** التفخيم ): Bir şeyi qalınlaşdırmaq deməkdir. Təcviddə isə, təfxim hərflərini oxuyarkən dilin kökünün üst damağa qalxması səbəbilə hərfə bir qalınlıq gəlməsi və ağzın içinin səs ilə dolmasıdır. Təfxim hərflərinə hüruful-mufəxxəmə deyilir. İstila hərflərinin hamısı eyni zamanda təfxim sifətli hərflərdir. Bundan əlavə qalın oxunan hərflərdən sonra gələn əlif də bu vəziyyətdə mufəxxəmə sifətli hərflərdən sayılır. Məsələn:صار طال kəlmələrində keçən əlif hərfi, qalın hərflərdən sonra gəldiyi üçün o da qalın oxunmaq məcburiyyətindədir. Çünki əlif, özündən öncəki hərfə tabedir.

**Xafə** (الخفاء) : Luğətdə gizləmək deməkdir. Temrin olaraq isə, özündən öncəki hərfə qatıldığı zaman hərfin səsinin gizli olmasına deyilir. Hərfi dörddür. Bunlar məd hərfləri olan و ي ا və هـ dir və ziddi zühurdur (aşkar etmək).

**Ğünnə** (الغنة): Gənizdən gələn səs deməkdir. Sakin və ya hərəkəli olaraq gələn م və نhərflərinə məxsus qüvvətli bir sifətdır. Təcvid alimləri, ğunnənin sifəti lazimədən olduğunu bəyan etmişdirlər. Bu hərflər istər sakin, istərsə də hərəkəli olsunlar bu sifətlər özlərindən ayrılmazlar. Bu mövzu haqqında irəlidə daha geniş malumat veriləcəkdir.

**Tərqiq** (الترقيق)**:** Lüğətdə incəltmək, zayiflətmək mənalarına gələn tərqiq, təcvid elmində isə tərqiq hərflərini incə oxumağa deyilir. Tərqiq hərflərini oxuyarkən dilin kökünü üst çənəyə qaldırmadan aşağıda tutub hərfin zatına bir incəlik gəlməsi, hərfin səsilə ağız içinin dolmaması və nəticədə hərfin incəlməsidir. Hərfləri, təfxim sifətinin hərflərinin xaricində qalan hərflərdir.

Beləcə sifətləri xülasə etmiş olduq. İndi isə mövzunun daha yaxşı başa düşülməsi üçün hərflərin aid olduqları sifətləri göstərən bir cədvəl ilə mövzunu xülasə edək.

[12] İbnül-Cəzəri, *Müqəddimə,* İstanbul 1310, s.74

| | | | |
|---|---|---|---|
| **1.** | Həmzə | ا | Cəhr, şiddət, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **2.** | Bə | ب | Cəhr, şiddət, qəlqələ, infitah, istifalə, tərqiq, zühur, izləq. |
| **3.** | Tə | ت | Həms, şiddət, infitah, istifalə, tərqiq, ismət. |
| **4.** | Sə | ث | Həms, rixvət, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **5.** | Cim | ج | Cəhr, şiddət, qəlqələ, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **6.** | Hə | ح | Həms, rixvət, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **7.** | Xa | خ | Həms, rixvət, infitah, istila, təfxim, zühur, ismət. |
| **8.** | Dəl | د | Cəhr, şiddət, qəlqələ, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **9.** | Zəl | ذ | Cəhr, rixvət, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **10.** | Ra | ر | Təkrir, cəhr, beyyinə, infitah, istifalə, tərqiq, zühur, izləq. |
| **11.** | Zəy | ز | Cəhr, rixvət, safir, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **12.** | Sin | س | Həms, rixvət, safir, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **13.** | Şin | ش | Həms, rixvət, təfəşşi, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **14.** | Sad | ص | Həms, rixvət, safir, itbəq, istila, təfxim, zühur, ismət. |
| **15.** | Dad | ض | Cəhr, rixvət, istifalə, itbəq, istila, təfxim, zühur, ismət. |
| **16.** | Ta | ط | Cəhr, şiddət, qəlqələ, itbəq, istila, təfxim, zühur, ismət. |
| **17.** | Za | ظ | Cəhr, rixvət, itbəq, istila, təfxim, zühur, ismət. |
| **18.** | Ayn | ع | Cəhr, beyyinə, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **19.** | Ğayn | غ | Cəhr, rixvət, infitah, istila, təfxim, zühur, ismət. |
| **20.** | Fə | ف | Həms, rixvət, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **21.** | Qaf | ق | Cəhr, şiddət, qəlqələ, infitah, istila, təfxim, zühur, ismət. |
| **22.** | Kəf | ك | Həms, şiddət, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **23.** | Ləm | ل | Cəhr, beyyinə, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **24.** | Mim | م | Cəhr, beyyinə, ğünnə, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **25.** | Nun | ن | Cəhr, beyyinə, ğünnə, intifah, istifalə, tərqiq, zühur, ismət. |
| **26.** | Vav | و | Cəhr, rixvət, infitah, istifalə, tərqiq, zühur, ismət. |
| **27.** | Hə | هـ | Həms, rixvət, infitah, istifalə, tərqiq, xafə, ismət. |
| **28.** | Yə | ى | Cəhr, rixvət, infitah, istifalə, tərqiq, zühur, ismət. |

Bu cədvəllə hərflərin sifətlərinin daha yaxşı başa düşüləcəyi qənaətindəyik. Sifətlər mövzusu Quran və təcvid öyrənmədə bilinməsi lazım olan bir mövzudur, lakin ilk olaraq öyrənilməsi lazım gələn mövzulardan biri deyildir. Quran tələbəsi, Quran oxumağa başlayıb bir neçə cüz oxuduqdan sonra bu mövzunu öyrənməlidir. Lakin təcvid elmində mükəmməliyə çatmaq üçün hərflərin sifətlərinin mütləq bilinməsi lazımdır.

**3. Hərəkələr**

Ərəbcədə hərflər hərəkəsiz ya da sükunsuz olmazlar. Hərəkəli hərfə mütəhərrik, hərəkəsiz hərfə də sakin hərf deyilir.

Hərəkə, fəthə (üstün) ـَ kəsrə (əsrə) ـِ və zəmmə (ötrə) ـُ olmaq üzərə üçdür. Üstünlü hərfə məftuh, əsrəli hərfə məksür və ötrəli hərfə də məzmum deyilir. Fəthənin əlif ( ا ) ilə, əsrənin yə ( ى ) ilə və ötrənin vav ( و ) ilə münasibəti vardır. Bu münasibət mədlər bölməsində daha ətraflı bir şəkildə izah ediləcək.

Bir hərəkə miqdarını qiraət alimləri, “bir barmağı açacaq və ya yumacaq qədər keçən zaman” olaraq ifadə etmişdirlər. Barmağı açıb yummaq oxunuşun sürətilə əlaqəli olaraq dəyişir. Oxunuş əsnasında hərəkənin düzgün oxunub oxunmaması tilavətə təsir göstərir. Əgər hərəkə əksik oxunarsa, o hərf tam və səhhətli bir şəkildə oxunmamış olar. Beləcə ləhni-cəli dediyimiz böyük xatanı ortaya çıxarar.

Hərəkənin sağlam oxunuşunda, ağzın vəziyyətinin də çox böyük əhəmiyyəti vardır. Çünki ağzın halı və şəkli hərəkənin qəlibi deməkdir. Əgər ağzın halı oxunacaq hərəkəyə uyğun hala gətirilməzsə, hərfin istənilən şəkildə oxunması da mümkün olmaz.

Hərəkənin növünə görə ağzın şəklini belə tərif edə bilərik:

Fəthə hərəkəsini oxuyarkən ağız normal bir şəkildə açıq olmalıdır. Əks təqdirdə yəni dodaqların təbii bir formada açılmaması halında səs, “O” səsinə, və ya üst çənənin kifayət qədər qalxmamasıyla “İ” səsinə meyl edər.

Kəsrə hərəkəsini oxuyarkən ağzı alçaldmaq yəni üst çənəni alt çənəyə tamamilə hakim qılmaq lazımdır. Əks təqdirdə kəsrə, fəthəyə meyl edər.

Zəmmənin tələffüzündə isə dodaqların irəliyə uzadılaraq tam mənasıyla

toplanmasına diqqət edilməsi lazımdır. Necəki bu toplanma işi tam olmazsa bu hərfin səsi “O” səsinə bənzəyər ki, bu da istənilən bir oxunuş olmaz.

Hərəkə, hərfin incə ya da qalın oxunmasında təsiredici bir amil deyildir. Hərfin incə ya da qalın oxunması o hərfin sifətilə əlaqəlidir. Hərəkəsi nə olursa olsun incə hərfləri incə oxumaq, qalın hərfləri də qalın oxumaq lazımdır.

## B. BƏZİ HƏRFLƏRİN OXUNUŞ ŞƏKİLLƏRİ

Təcvid elmində bəzi hərflərin oxunuşunda xüsusi bir sıra qaydalar mövcuddur. Aşağıda izah edəcəyimiz kimi, bu hərflər bəzi hallarda qalın, bəzi hallarda da incə oxunur. Təcvid qaynaqlarında bu hərflərlə əlaqəli olaraq ixtilaflı məsələlərə də yer verilmişdir. Lakin biz burada ümumi hökümləri ifadə etməklə kifayətlənəcəyik. Bu hərflər ر və ل hərfləridir. Bunların oxunuşuyla əlaqəli hökümləri maddələr halında izah ədək.

### 1. “Ra” ( ر ) hərfinin okunuş şəkilləri ( احكام الراء )

Ra hərfinin oxunuşunda əsas olan qayda qalın oxunmasıdır. Lakin ra hərfinin digər hərflərdən fərqli bir xüsusiyyəti mövcuddur. Digər hərflərin qalınlığı ya da incəliyi şəxsən özlərindəndir. Yəni hərflər ya qalındır ya da incə. Ancaq “ra” hərfi olduğu məhəllərə görə incəlik və ya qalınlıq qazanır.

“Ra” (ر) hərfi, sifəti-hüruf (hərflərin sifətləri) babında sözü keçdiyi üzərə ariz istila hərflərindəndir. Dolayısıyla qalın və incə oxunmağa müsaitdir. Hərəkəsi üstün və ötrə ikən qalın, əsrə ikən incə oxunur. Əgər sakin olursa, əvvəlində olan lazım və ariz kəsrələr, istila hərfləri və lin hərfləri; sonrasında isə istila hərfləri və bu hərflərin hərəkələri (ر) nın qalın və incə oxunmasına təsir edirlər.

İmam Asim qiraətinin İmam Həfs rəvayətinə görə (ر) nın 12 halı vardır. Bu 12 halın 5i qalın, 4ü incə, 3ü isə həm incə, həm də qalın oxunur.

Ra (ر) hərfinin hallarını “qalın oxunduğu yerlər”, “incə oxunduğu yerlər”, “qalın və ya incə oxunması caiz olan yerlər” başlıqları adı altında izah edək.

a. Qalın oxunduğu yerlər*:*

1) “Ra” hərfi üstün və ya ötrə ilə hərəkəli isə qalın oxunur. (رَسُولٍ - فَرَاشًا - كَافَرُون) kimi.

2) “Ra” sakin əvvəli üstün və ya ötrə olursa yenə qalın oxunur. (بَرْق - اُرْكُضْ) kimi.

3) “Ra” sakin, əvvəli də sakin olursa daha əvvəlinə etibar olunur. Daha əvvəli üstün və ötrə isə yenə (ر) qalın oxunur. (بِالصَّبْرِ - عُسْر) kimi.

4) “Ra” sakin əvvəlində ariz əsrə olarsa qalın oxunur. (إِنِ ارْتَبْتُمْ - لِمَنِ ارْتَضَى) kimi.

5) İncə oxunması lazım olan (ر) nın önündə (sonrasında) məftuh (fəthəli) istila hərfi olarsa qalın oxunur. (إِرْصَادًا - قِرْطَاسٍ - فِرْقَةٍ) kimi. Ancaq bu hökum, (ر) ilə istila hərfi eyni kəlmədə olduğu zaman meydana gəlir. Ayrı kəlmələrdə olurlarsa qalın oxunmaz. Məsələn: (وَلاَ تُصَعِّرْ خَدَّكَ) ləfzində (تُصَعِّرْ) dəki (ر) sakin, məqəbli (əvvəli) məksür, (خ) da istila hərfi olduğu halda ayrı kəlmələrdə olduqlarına görə (خ), ra hərfinə təsir etməz.

b. İncə oxunduğu yerlər*:*

1) Əsrəi-lazimə (əslindən əsrəli) ilə hərəkəli olarsa incə oxunur. (يُرِيدُونَ - رِجَالٍ) kimi. Ariz əsrə ilə hərəkəli isə vəziyyət yenə eynidir: (وَأَنْذِرِ النَّاسَ - وَذَرِ الَّذِينَ) kimi. (أَنْذِرِ - ذَرِ) kəlmələri əmr olduqları üçün əslləri (أَنْذِرْ - ذَرْ) dir. Vəsl üçün əsrəi-arizə (müvəqqəti əsrə) ilə hərəkələnirlər.

2) (ر) sakin, əvvəli əsrə olarsa incə oxunur: (فَاصْبِرْ - وَاسْتَغْفِرْهُمْ) kimi.

3) (ر) sakin, əvvəli də sakin, daha əvvəli əsrə olarsa:

(قَدِير - حِجْر - اَلذِكْر) kimi.

4) Sakin (ر) nın əvvəlində lin hərfi (يْ) olarsa: (سَيْر - خَيْر) kimi.

C- Qalın və incə oxunması caiz olan yerlər:

1) Əsrədən sonra gələn sakin (ر) nın önündə (sonrasında) istila hərfi məksür olaraq gəlib, ikisi də eyni kəlmədə olarsa: (فِرْقٍ) kimi.

2) Sakin (رْ) nın əvvəlində sakin istila olub və əvvəli də məksür olarsa: (عَيْنَ الْقِطْر - مِنْ مِصْر) kimi. Bu kəlmələrdə höküm hər nə qədər belə isə də (yəni incə və qalın oxumaq caiz isə də) (ر) ların vəsl hallarına baxaraq vəqf etmək daha yaxşıdır. Yəni: (قِطر) də (ر) nı incə oxumaq, (مَصْرَ) da qalın oxuyaraq vəqf etmək daha yaxşıdír.

3) Vəqf halında qaydalara görə qalın oxunması lazım gələrkən kəlmənin əslinə işarə etmək üçün incə oxumaq: (أَسْرَ - إِذَا يَسْرَ) kəlmələri. Əslləri (أَسْرِي - إِذَا يَسْرِي) dir.

Ra (ر) şəddəli olarsa höküm müdgamün fih (üzərinə idğam edilən) olan ikincisinə aiddir: (يُحَرِّفُونَ) də incə, (مِنَ الشَّيْطَانِ الرَّجِيم - يَفِرُّونَ) də qalın.

**2. Ləfzətullahdakı (الله) "Ləm" (ل) hərfinin oxunuş şəkilləri**

**( احكام الام )**

"Ləm" ( ل ) hərfi ümumiyyətlə istifalə hərflərinin hökmünə tabe olmaqla birlikdə, başqa xüsusiyyətlər daşıması baxımından ayrı bir başlıq altında zikr edilməsi labüddür.

Ləfzətullah, (الله) kəlməsinin ləfzi deməkdir. (الله) kəlməsi başındakı vəsl həmzəsi ilə oxunarsa, (ل) qalın olar. الله nümunəsində olduğu kimi. Ləfzətullahın başındakı "əlif" vəsl həmzəsidir. Yəni başqa bir kəlmədən bu kəlməyə keçildiyində bu əlif oxunmaz. Bu səbəblə vəsl həmzəsidir. Ləfzətullah bir başa oxunduğunda "ləm" hərfi qalın oxunur.

Vəsl həmzəsi ilə deyil, ondan öncəki hərflə oxunarsa, yəni vəsl həmzəsindən öncə bir hərf varsa və bu hərfdən sonra "ləm" hərfinə keçilirsə aşağıdakı hökümlər meydana gəlir.

a) Bu hərfin hərəkəsi kəsrə isə (ل) incə oxunur. Məsələn: بِاللَّهِ / لِلَّهِ

b) Zəmmə və ya fəthə isə (ل) qalın oxunur. وَاللهِ / تَاللهِ / نَصْرُ الله misallarında "ləm" hərfləri qalın oxunur. اَللَّهُمَّ Ləfzində də yuxarıda qeyd etdiyimiz qaydalar əsas alınır.

قُلِ اللَّهُمَّ     قَالُوا اللَّهُمَّ

Kəlmələrindəki sağdakı kəlmədə “ləm” qalın, soldakı kəlmədə isə “ləm” incə oxunur.

**3. “Hə” ( ه ) Zəmiri və oxunuşu**

Bu babın mövzusunu meydana gətirən və Qurani-Kərimin yazı tərzindəki yuvarlaq ه dir. Bu eyni zamanda “ـه” yarım yuvarlaq şəklində və ya quyruqlu şəklində də “هـ” yazıla bilər. Buna həi-kinayə deyilir. Həi-kinayə müfrəd, müzəkkər, ğaib zəmirinə verilən isimdir. İsim, fel və hərflərə bitişir.

Zəmirin hökmünü iki maddədə toplaya bilərik:

1. Zəmirin əvvəli hərəkəli olarsa zəmir uzadılır: بِهِ - لَهُ - إِنَّهُ kimi. Ancaq مَا نَفْقَهُ - فَوَاكِهَ لَمْ يَنْتَهِ kəlmələrinin sonlarındakı هـ zəmir olmayıb kəlmənin əsl hərflərindən biri olduğu üçün uzadılmaz. Uzadılan zəmirin önünə həmzə gələrsə məddi-münfəsil olur. مِنْ عِلْمِهِ إِلَّا - عِنْدَهُ إِلَّا kimi. Çünki uzadılan zəmirin əsrəlisinin önündə müqəddər (görünməyən, gizli) (ى), ötrəlisinin önündə müqəddər (و), vardır ki, bu müqəddər (ى) və (و) dan sonra həmzə gəldiyi üçün məddi-münfəsil olur.

2. Zəmirin əvvəli (istər cəzimli, istər cəzimsiz) sakin olarsa zəmir uzadılmaz. Bu sakin iki cür görünür:

a) Hərfi-məd olaraq. فِيهِ - يَرُدُّهُ - إِنَاهُ kimi

b) Cəzimli hərf olaraq. إِلَيْهِ - مِنْهُ - عَنْهُ kimi.

Furqan surəsinin 69-cu ayəsindəki (فِيهِ مُهَانًا) dəki zəmir məd olunur.[13]

Qiraət imamlarının ikincisi olan İbn Kəsir (د) də bütün uzadılmayan zəmirləri sıla ilə oxur (yəni uzadır). (مِنْهُ - عَنْهُ - إِلَيْهِ -) kimi. Zümər surəsinin 7-ci ayəsində olan (يَرْضَهُ) dakı (هـ) zəmirdir. Əsli (يَرْضَاهُ) olduğuna görə, əslinə uyularaq uzadılmaz.[14]

---

[13] Bu zəmirin məd ilə oxunması bu rivayətin təvatür yoluyla sübutundan dolayıdır. Hər nə qədər burada “boğaz hərfi olan əsrəli (هـ) -dən dodaq hərfi olan ötrəli (م)- ə keçmək çətin olacağından bu məd edilmişdir” şəklində bir açıqlama edilsə də bu sonradan edilən bir izahdır.

[14] Bu ayədəki vəchə hərəkənin azını (üçdə birini) həzf edib, çoxunu ibqa etmək mənasında ixtiləs də deyilir.

## III. MƏD BƏHSİ

### A. MƏDLƏR

Məd; يَمُد  مَدّ  kökündən gələn bir məsdərdir. Lüğət mənası uzadmaq və artırmaqdır. Təcvid elmində isə, açıq və ya gizli məddi tələb rdən hərflərdən biri ilə özlərindən öncə gələn hərfin səsini uzadaraq oxumaq deməkdir. Qurani-Kərimdə məddin varlığında şübhə yoxdur. Ancaq səsin uzadılmasında qiraət alimləri arasında bəzi ixtilaflar görünür. Bu ixtilaflar mütəvatirdir və yeri gəldikcə izah ediləcəkdir.

Məddlə yanaşı, bir də "qəsr" (قصر) vardır. Qəsr məddin ziddidir və qısaldmaq mənasındadır. Uzadmadan oxumaq da deyə bilərik. Əsl olan qəsrdir. Məd isə təbi ki, bir səbəbə dayanmalıdır. Məddi qisimlərə ayırmadan öncə hərfi-məd və səbəbi-məd terminlərini izah edək.

**1. Məd hərfləri ( حروف المد )**

Bir kəlmədə, özündən öncəki hərfi bir əlif miqdarı uzadmağa səbəb olan hərflərə məd hərfləri deyilir. Hərfi-məd, hərəkəli hərfi tələffüz etmə əsnasında, onu bir əlif ölçüsündə uzadan hərəkəsiz (sakin) hərfin adıdır. Bu hərflər üç dənədir: Əlif (ا), Vav (و), Yə (ي).

Bu üç hərfin, hərfi-məd olması üçün iki şərt vardır.

1. Sakin olmaları. Yəni cəzimli və ya hərəkəsiz olmaları.
2. Məd hərfinin öncəsində öz cinsindən hərəkə olması.

Əlif (ا) dən öncə ـَ (fəthə)

Yə (ى) dən öncə ـِ (kəsrə)

Vav (و) dan öncə ـُ (zəmmə)

Bu iki şərt hayata keçərsə bir öncəki hərfin hərəkəsinə əsaslanaraq, təyin edilmiş şərtlər[15] daxilində uzadılaraq oxunur. Hərfi-mədlərin məxrəcləri (çıxış

[15] Müəyyən şərtdən məqsəd, hərfi-mədlərdən sonra sükunlu bir hərfin olmamasıdır. şarttan kasıt, harf-i medlerden sonra sakin bir harfin bulunmamasıdır. Əgər sakin hərf olarsa, məd hərfi yazılsa belə, oxunmaz. Məsələn: قَالُواالآنَ nümunəsində olduğu kimi.

yerləri) ağız, boğaz boşluğudur. Sakin hərf, hərəkəsi olmayan hərf deməkdir. Bunun əlaməti isə cəzmdir.

Yuxarıda da qeyd etdiyimiz kimi məd hərflərinin birincisi özündən öncəki hərfin hərəkəsi fəthə (üstün), özü isə sakin olan "əlif" hərfidir. قَال kəlməsində göründüyü kimi sakin yəni hərəkəsiz olan "əlif" hərfi, əvvəlindəki hərəkəsi üstün olan "gaf" ( ق)hərfini yuxarı doğru uzadaraq oxudur.

Məd hərflərinin ikincisi isə özündən öncəki hərf məksür (əsrə) və özü sakin olan "yə" hərfidir. Bu vəziyyətdə olarsa, özündən bir əvvəlki kəsrəli hərfi aşağıya doğru "ı" ya da "i" səsi verərək uzadır. قِيلَ və فِيهَ misallarında olduğu kimi.

Məd hərfi olan "yə" ى daima sakindir. Məd hərfi olmayan "yə" isə يُسرٌ misalındakı kimi bəzən hərəkəli, سَيرٌ misalındakı kimi də bəzən sakin gələ bilər.

Məd hərflərinin üçüncüsü də yuxarıda yazdığımız kimi "vav" ( و) hərfidir. "Vav" hərfi sakin, özündən öncəki hərf ötrə ilə hərəkəlisə, bu vəziyyətdə "vav" hərfi zəmmə ilə hərəkəli olan hərfi irəli doğru "u" və ya "ü" şəklində uzadır. ويقُولُونَ kəlməsində iki dəfə göründüyü üzərə, "vav" hərfi hərfi-məd olaraq gəlmişdir. Bu mövzu ilə əlaqəli misallar məddi-təbii bəhsində geniş şəkildə veriləcəkdir.

**2. Səbəbi-Məd**

Buna, çox uzadmağa səbəb olan məd də deyilir. Məd hərfindən sonra, uzadılması lazım olan hərfi, daha çox uzadaraq oxudana səbəbi-məd deyilir. Hərfi-məddən dərhal sonra gəlir, həmzə və sükun olmaq üzərə ikiyə ayrılır. Daha sonra gələcək olan mövzular bu iki məfhumla yaxından əlaqəli olduğu üçün, bu kəlmələrin təriflərini ətraflı bir şəkildə açıqlamaq vacibdir.

**a. Həmzə ( ء )**

Hərəkəli olan əlifə həmzə "ء" deyilir. Uzun və qısa əlif şəklilə yazıla bilir. Həmzə əslində, "əlif" hərfindən başqa bir hərfdir. Kəlmənin əvvəlində أخذ misalında olduğu kimi gələ bilər. Fəqət qrammatik qaydalara görə kəlmənin başında gələrsə ا hərfinin üzərində أ şəklində yazılır. Bəzən də sadəcə "ء" şəklində yazılır. Bunlar tamamilə ərəb dilinin qrammatika qaydalarına görə yazılır. Biz bu çalışmamızda həmzənin yazılışı üzərində durmayacağıq.

Mövzunun, qiraət və təcvid elmi ilə əlaqəli qismi olan vəsl və qəti həmzələrini izah edəcəyik.

Kəlmənin əvvəlindəki həmzələr vəsl və qəti olaraq iki qismə ayrılır.

1) Vəsl həmzəsi: Bir öncəki kəlmənin son hərfini oxuyub, başında həmzə gələn kəlməyə keçərkən və bu keçiş əsnasında bir öncəki kəlməylə başında həmzə gələn kəlməni birləşdirdiyimizdə həmzə düşürsə bu vəsl həmzəsidir. Belə bir halda həmzə düşməzsə, bu durumda qəti həmzəsidir.

Əslinda ərəb dili qrammatikasında vəsl həmzəsilə qəti həmzəsi bir-birindən tamamilə ayrılmışdır. Biz bəzi mühim maddələri sayaraq mövzuya açıqlıq gətirək.

Quran oxuyan insanın ən çox qarşılaşacağı vəsl həmzəsi, bir çox kəlmənin başında olan və başında olduğu kəlməni mərifə (müəyyən) edən ال birləşməsinin başındakı əlif hərfidir. Bu vəsl həmzəsidir. Ləfzətullah qismində də açıqladığımız kimi الله kəlməsinin başındaki əlif hərfi də vəsl həmzəsidir. Bu saydıqlarımızın xaricində ərəb dilində bəzi kəlmələrin başındakı həmzə də vəsl həmzəsi sayılır. Bunlar; امرأة، امرؤ، ابنة، ابن، اسم، اثنين، اثنتين kəlmələridir. Bununla birlikdə əmr siğələrinin başındakı həmzələr də vəsl həmzəsidir.

2) Qəti Həmzəsi: həm başlanğıcda, həm də keçiş əsnasında xətt və ləfiz etibarilə sabit olan həmzələrdir. Bu həmzələri belə sıralaya bilərik.

İstifhəm yəni sual həmzələri qətidir. قل أَتَّخَذتُم kəlməsinin əsli قل أاتَّخَذتُم idi. iki həmzənin bir araya gəlməsindən dolayı vəsl həmzəsi olan ikinci həmzə həzf edilmişdir. Birinci həmzə istifhəm həmzəsi olduğu üçün qətidir və həzf edilməz. Həm yazıda, həm də tələffüzdə görünür.

Mütəkəllim vəhdə (birinci şəxsin təki) felinin həmzəsi də qətidir. وَأَعلمُ، وأَعتَزِلُكُم fellərinin başlarındakı həmzələr qətidir. İfal babının həmzəsi, təəccüb felinin həmzəsi, ismi-təfdil həmzələri kimi həmzələr qəti həmzələridir.

Bu məsələ ərəb dilinin qrammatikasıyla əlaqəli olduğu üçün burada çox təfsilata girməyi lazım bilmədik. Fəqət bunu söyləmək lazımdır ki, əgər həmzə vəsl həmzəsiysə, əlif hərfinin üzərində ( أ ) şəklində həmzə olur. Əgər həmzə

qəti isə əlif hərfinin üzərində həmzə olmaz. Quran oxuyucusu bu qaydaya diqqət etdiyi təqdirdə həmzəni xatasız bir şəkildə oxuya bilər.

**b. Sükun ( ه )**

Səbəbi məddin ikincisi sükundur. Sükun isə hərəkəsizlik deməkdir. Əlaməti isə cəzm ( ه) dir. Sükun, lazım və ariz olmaq üzərə iki qismə ayrılır.

1) Sükunu-Lazım ( السكونُ اللازمُ ) : həm vəqf (duruldduğunda), həm də vəsldə (keçildiyində) varlığını davam etdirən sükundur.[16] ان كُنتُم تُؤمِنُنَ بالله ayəsində gördüyümüz cəzimli hərflərin sükunu-lazımı sükundur. Bundan əlavə şəddəli gördüyümüz və əslində eyni olan iki hərfdən birincisinin sükunu lazımi sükundur.

2) Sükunu-Ariz (السكون العارض ) : Quran tilavəti əsnasında vəqf edildiyi yəni durulduğu zaman ortaya çıxan, vəsl də isə yəni oxumağa davam edildiyində öz-özündən itən sükuna arizi-sükun deyilir. Məsələn: fatihə surəsini oxuyarkən hər ayənin sonunda dursaq, ayə sonlarındakı hərəkəli hərfləri məcburən cəzmli oxumaq məcburiyyətində qalırıq. Bu vəziyyətdə yəni vəqf nəticəsində ortaya çıxan sükunlar arizi-sükunlardır.

## B. MƏDDİN NÖVLƏRI

Mədlər əsli və fəri olmaq surətilə iki qismə ayrılır. Əsli məddin digər adı təbii məddir. Fəri məddlər isə “məddi-müttəsil, məddi-münfəsil, məddi-lazım, məddi-ariz və məddi-lin olmaq üzərə beş qisimdir. Qurani-Kərimi tilavət edənlərin ən çox qarşılaşacağı təcvid qaydaları arasında mədlər ilk sırada yer alır. Ona görə də bu mövzunun yaxşı başa düşülməsi vacibdir.

**1. Əsli Məd (Məddi-Təbii)**

Hər hansı bir kəlmədə məd hərflərindən biri olarsa fəqət çox uzadmağa səbəb olan həmzə və sükun olmazsa məddi-təbii yəni əsli-məd olur. Başqa bir səbəbə ehtiyacı olmayan və bir əlif miqdarı uzadılan məd şəklində də tərif edilmişdir. “نُوحِيها” misalında bu vəziyyət gözə çarpır.

[16] ən-Nisə, 4 / 59

İlk misalı təhlil etdiyimizdə; “نُوحِيهاَ” kəlməsindəki ilk hərf olan “ن” hərfini “u” şəklində bir əlif miqdarı uzadan “و” hərfi, “ح” hərfini “i” səsilə bir əlif miqdarı uzadan “yə” hərfi, üçüncü olaraq da “ه” hərfini “ə” səsilə bir əlif miqdarı uzadan “ا” hərfi gələrək təbii məd olmuşdur.

Məd hərfləri başlığında, “əlif, vav, yə” hərflərinin hansı hallarda məd hərfi olacağını izah etmişdik.[17] Onu da qeyd etmək lazımdır ki, məddi-təbii dediyimiz əsli mədlər hər zaman bir əlif miqdarı uzadılır. Məddi-təbinin bir əlif miqdarı uzadılması vacibdir. Mütləq uzadılması lazımdır. Bütün qiraət imamları bir əlif miqdarı uzadılması xüsusunda ittifaq etmişdirlər. Bir əlif miqdarı isə təxminən bir saniyəyə bərabərdir. Qədim təcvid kitablarında bir əlif miqdarı, oxuyanın açıq olan barmağını yumması ya da qapalı olan barmağını açması əsnasında keçən zaman qədər olduğu ifadə edilmişdir.

Məd hərfləri və ya hərfi-məd hər zaman yazıda açıq bir şəkildə görünməyə bilər. Belə oldugu halda məddi-təbii təqdiridir (gizlidir). “اَنَّه هُو” ifadəsində birinci “hə” ni uzadan təqdiri bir “vav” hərfi vardır.

Quran oxuyucusu, bəzi kəlmələrdəki mədləri ilk baxışda görməkdə çətinlik çəkə bilər. Bu səbəblə bəzi kəlmələrin izahını burada verməyi uyğun gördük.

Quranda keçən bəzi kəlmələrin son hərflərində məddi-təbii olduğu halda xətt yəni yazı etibarilə bəzən yoxmuş kimi görünə bilər. Fəqət orada əslinda məddi-təbii vardır. Bunu göstərmək üçün də məd olan hərfin altına kiçik xətlə مد (məd) yazılır. Kəlmənin altında bu kiçik məd yazısını görən oxuyucu, bu şəkildə orada məddi-təbii olduğunu asanlıqla anlayır.

لِتَستَوُا، قال اخسَوُا، لِيَسُوؤُا، وإن تَلوُا، اِقرَؤُا، نَبَؤُ، جَاؤُ، باؤُ، شَاؤُ، تَبَرَّؤُا،
فَادرَؤُا، بَدَؤُا، يُدفِؤُا، لِيُطَافِؤُا،

kəlmələrinin son hərfləri mədli (uzadılaraq) oxunur.

ولاتَلوُنَ، يَلوُنَ، لايَستَوُنَ، هَل يَستَوُنَ، يَستَهزِؤُنَ، ولا يؤُدُّ، رُؤُسُ، يُراؤُنَ،
يطَؤُنَ، يُضاهؤُنَ، يَستَنبِؤُنَ، لِيؤُسُ، تَشاؤُنَ، داوُدَ، رَؤُفُ، ويدرَؤُنَ، يَقرَؤُنَ، بَرِيؤُنَ،

[17] Bax. səh 32.

مُبَرَّؤُنَ، غاوُنَ، يَتَّكِؤُنَ، خاطِؤُنَ

kəlmələrinin sondan bir öncəki hərfləri yenə mədli (uzadılaraq) oxunur.

Yenə Quranda ilk baxışda məd hərfi kimi görünən, əslində məd hərfi olmayıb sadəcə yazıyla əlaqəli olaraq kəlmədə yer alan vav ( و) hərflərindən öncə gələn həmzələr ya da üzərindəki həmzələr uzadılmadan mədsiz oxunur. اُولئكَ، يااولَى، مايَعبَؤُا، جَزاَؤُا، تَفتَؤُا، شُرَكاؤُكُم، نساؤُكُم kəlmələrində bu vəziyyət gözə çarpmaqdadır. Bəzi musfahlarda məd kimi görünüb əslində məd olmayan bu kimi hallarda məd olmayan hərfin altında qəsr (قَصر) işarəsi mövcuddur. Məd hərflərinin altında قَصْر yazarsa o məddi-təbii uzadılmaz. Bu işarələrə diqqət edildiyi təqdirdə Quran oxuyucusunun xata etmə ehtimali çox azdır.

**2. Fəri Mədlər**

Yuxarıda bu mədlərin hansılar olduğunu zikr etmişdik. Bunlar sırasıyla; məddi-müttəsil, məddi-münfəsil, məddi-lazım, məddi-ariz və məddi-lin olmaq üzərə beşdir.

**a. Məddi-Müttəsil**

Bitişik məd deməkdir. Qaynaqlarda vacib məd şəklində də keçir. Hərfi məddən sonra səbəbi məd həmzə olub ikisi bir kəlmədə olarsa məddi-müttəsil olur. Digər bir ifadə ilə:

1. Hərfi məd olmalı.
2. Səbəbi məddən həmzə olmalı.
3. İkisi də bir (eyni) kəlmədə olmalı.

Bu üç şərt hasil olduğu təqdirdə məddi müttəsil olur.

Misal: سُوءَ -سِيٓءَ - أُلَٰئِكَ kimi. Verdiyimiz misallarda məd hərflərindən sonra səbəbi-məddən həmzə arxa-arxaya gəlmiş və eyni kəlmə içərisindədir. Birinci misalda ل hərfini məd hərflərindən, yuxarı doğru uzadan təqdiri bir əlif, onun ardından da səbəbi-məddən həmzə gəlmişdir. İkinci misalda س hərfini aşağıya doğru uzadan məd hərflərindən ي gəlmiş, daha sonra da səbəbi-məddən həmzə gəlmişdir. Üçüncü misalda da yenə س hərfini uzadan و gəlmiş,

arxasından da səbəbi-məddən sükun gəlmişdir və eyni kəlmə içərisindədir. Bu saydığımız səbəblərdən dolayı məddi-müttəsil meydana gəlmişdir.

Aşağıdakı misalları eyni əsaslar çərçivəsində təhlilə tabe tutaraq məddi-müttəsil mövzusunu daha yaxşı anlamağa çalışaq.

خَلاَئفُ، وَقِثَّائُها، اسمَائه، يُضِيءُمَن يَشاءُ، ولاَنِساءً، مِن السّمَاءِ

Məddi-müttəsilin məddinin yəni uzadılmasının hökmü vacibdir. Çünki bütün qiraət imamları məddi-müttəsilin uzadılması üzərində ittifaq etmişdirlər. Məddi-müttəsilin ən az uzadılma miqdarı iki əlif miqdarıdır. Ən çox uzadılma miqdarı isə beş əlifdir. Bizim qiraət imamımız Asım və onun tələbəsi Həfs, məddi-müttəsili dörd əlif miqdarı uzadaraq oxumuşlar. Biz də bu qiraəti mənimsədiyimiz üçün məddi-müttəsili dört əlif miqdarı uzadaraq oxuyuruq. Çünki, qiraət elmi qaydalarına görə hər hansı bir imamın qiraəti üzərinə oxunursa, o imamdan rəvayət edilən bütün oxunuş vəcihlərində o imama riayət etmək vacibdir.[18]

Qurani-Kərimin oxunuş şəkillərinin zaman və mədlər baxımından mülahizəsini “tilavət şəkilləri” başlığı altında (səh. 10-11) işləmişdik. Burada eyni mövzuya mədlər baxımından qısaca təmas etməkdə fayda var.

Hər oxuyucunun bilməsi lazımdır ki, Qurani-Kərim üç təriq (mərtəbə, seyr, tərz) üzərə oxunur.

1) Təhqiq (yavaş oxunuş): Bu oxuyuşda mədlər 4 və ya 5 əlif uzadılmaq surətilə və hərflərin məxrəc və sifətlərinə ciddi şəkildə diqqət yetirilərək oxunur. Əşər oxunarkən olduğu kimi.

2) Tədvir (orta oxunuş): Mədlər üç əlif uzadılaraq oxunur. İki yarım, üç yarım əlif də üçə daxildir. Yenə hərflərin məxrəc və sifət haqlarını tam verərək fəqət təhqiqdən biraz daha sürətli oxunur.

3) Hədr (sürətli oxunuş): Hərflərin haqları diqqətə alınaraq və mədlər “münfəsil bir, müttəsil iki, lazım üç əlif” uzadılaraq oxunur.

**b. Məddi-Münfəsil**

Hərfi-məddən sonra səbəbi-məddən həmzə olub ikisi ayrı kəlmələrdə

---

[18] əs-Süyuti, el- İtqan, I, 272.

(hərfi məd birinci kəlmənin sonunda, səbəbi-məddən həmzə ikinci kəlmənin başında) olarsa məddi- münfəsil olur.

Misal: كَانُوآ أَشَدَّ – قَالُوآ أَوَلَمْ – تُوبُوآ إِلَى اللهِ – إِنِّي أَخَافُ - يَآ أَيُّهَا kimi.

Digər bir ifadə ilə:

1. Hərfi-məd olmalı.
2. Səbəbi-məddən həmzə olmalı.
3. İkisi ayrı-ayrı kəlmələrdə olmalı.

Yuxarıda vermiş olduğumuz misallardan birincisini təhlil edək. إِنِّي أَخَافُ nümunəsində birinci kəlmədə “ن” hərfini uzadan məd hərfi “ي” mövcuddur. Məd hərfindən sonra isə səbəbi-məddən həmzə gəlmiş və ikisi ayrı kəlmələrdə yer alır.

Yuxarıda verdiyimiz misallardakı məd hərfləri zahiridir. Yəni kəlmənin sonunda açıq olaraq görünür. Fəqət bəzi hallarda məd hərfləri təqdiridir. هذه إيمانا، مِن عِلمهِ اِلا misallarında “hə” zəmirindən sonra təqdiri bir “yə” vardır.

Məddi-münfəsilin asan tanına bilinməsinin işarəsi həmzənin uzun əlif şəklində yazılmasıdır.

/ قُلْ يَآ اَيُّهاَ الْكاَفِرُونَ / تُوبُوآ اِلَيَ اللهِ / اِنيّ أَخاَفُ اللهَ

مِنْ عِلْمِهِ اِلاَّ بِماَ شاَءَ / عِنْدَهُ اِلاَّ بِاِذْنِهِ

Məddi-müttəsilin asan tanına bilinməsinin işarəsi isə həmzənin qısa əlif şəklində yazılmasıdır. Amma həm məddi-müttəsil, həm də məddi-münfəsil üçün istisnalar vardır.

Məddi-müttəsil olub məddi-münfəsil kimi yazılan; اَنْ تَبُواَ بِاِثْمِي

Məddi-münfəsil olub məddi-müttəsil kimi yazılan; هَـؤُلاَءِ

Qiraət imamları məddi-münfəsilin məd və ya qəsr oluşu, əgər məd isə məddin hansı ölçüsü ilə oxunacağı mövzularında ixtilaf etdiklərindən, məddi-münfəsilın hökmü caiz olmasıdır. Yalnız bu cəvaz hökmünü doğru anlamaq

lazımdır. Bir çoxlarının yanlış anladığı kimi, bundan məqsəd hər istəyən, münfəsil məddi istədiyi şəkildə, bir qaydaya bağlı olmadan oxuya bilər demək deyildir. Bunda diqqət ediləcək xüsus, hansı imamın qiraəti üzərinə oxunursa, o imama uymanın məcburiliyidir. Bizim oxuduğumuz Asim qiraətində məddi-müttəsillər ən az bir, ən çox dörd əlif miqdarı uzadılmalıdırlar.

**c. Məddi-Lazım**

Fəri mədlərin üçüncüsü məddi-lazımdır. Hərfi məddən sonra səbəbi-məddən sükun u-lazım gəlib, ikisi də bir kəlmədə olarsa məddi-lazım olur. Məddi-lazımın bu isimlə adlandırılmasının səbəbi, bütün qiraət imamlarının məddi-lazımın məd ilə oxunması mövzusunda ittifaq etmələridir. Bu mövzuda hər hansı bir ixtilaf olmamışdır. Bəzi qaynaqlara görə isə; səbəbi-məd olan sükunun kəlmənin həm vəsl, həm də vəqf halında sabit qalması və düşməməsi səbəbilə bu isim verilmişdir.

Sükunu-Lazım: Vəqfən (durulduğunda) və vəslən (keçildiyində) sabit olan sukuna deyilir. Misal : مْ - لْ - دْ - جْ - تْ kimi bütün hərflərin cəzimli halları sükunu-lazımdır.

لا تُضارّ وَالِدةٌ، قال أتُحاجُّونّى ، و مَن يُشاَقّ الله

Misallarının hamısında məddi-lazım olduğu görünür. Verilən misallardan birini təhlil edək: لا تُضارّ وَالِدةٌ ləfzinda “dad” hərfini uzadan hərfi məddən əlif gəlib, arxasından isə səbəbi-məddən “ra” hərfinin lazımi sükunu gəlmişdir. Bu lazımi sükun “ra” hərfinin şəddəsindədir. Bu kəlmə əslində تُضاَرْرُ şəklindədir. Amma qrammatik qaydalara əsasən bu, şəddəli “ra” ( رّ ) ilə ifadə edilir. Dolayısıyla altı çızılmış şəddəli ra hərfindəki sükun lazımi sükundur. Gördüyümüz kimi lazımi sükun hərfi məddən sonra gəldiyi təqdirdə məddi-lazım olur.

Qurani-Kərimdə Yunus surəsi 51 və 91-ci ayələrdə yer alan tək nümunə: آلْئَنَ şəklində yazılır. Açıq olaraq اَالْ اَانَ şəklindədir. Burada həmzəni uzadan, məd hərflərindən təqdiri bir əlif, səbəbi-məddən isə lam hərfinin lazımi sükunu vardır. Məddi-lazım kəlmə və hərf olmaq üzərə ikiyə ayrılır. Bunlar da öz içərisində iki bölməyə ayrılırlar. Cədvəldə gördüyümüz kimi:




Məddi-lazımın hərfi-müsəqqəl və hərfi-müxəffəfəri, hüruful-müqəttəələrdəndir. Hüruful-müqəttəə bəzi surə başlarında yer alıb mənaları Allah (c.c.) və Rəsulu (s.ə.s) tərəfindən tam olaraq bilinən, insanları heyrətə salmaq üçün də Quranda yer alan mütəşabeh ayə olduqları ifadə edilən hərflərdir. Yəni hərf ayələrdir. Məddi-lazım hərfi-müsəqqələyə misal: الف لام ميم ← الم Məddi-lazımın kəlimei-müsəqqələ və kəlimei- müxəffəfələri ayələrdəki kəlmələr içərisində meydana gəlir. misal: الف لام را ← الر
Xülasə olaraq qeyd edəsi olsaq:

1) Kəlmeyi-müsəqqələ: Ağır kəlmə deməkdir. Ağır kəlmədən məqsəd "məd səbəbi olan sükunun yer aldığı hərfin" kəlmə içərisində və şəddəli olaraq gəlməsi deməkdir. خاصّة، مُدْهامَّتان، ولا لضالّين ləfizlərində bu vəziyyət mövcud olduğuna görə məddi-lazım kəlimeyi-müsəqqələ var. Məddi-lazım kəlimeyi-müsəqqələyə misal:

الضاَ لْ لينْ ← وَلاَ الضّالّين

2) Kəlmeyi-müxəffəfə: Xəfif kəlmə deməkdir. Xəfif kəlmədən məqsəd "uzadma səbəbi olan şəddəsiz sükunun yer aldığı hərfin" kəlmədə olması deməkdir. Bunun tək nümunəsi Yunus surəsini 51 və 91-ci ayələrində keçən آلْئنَ kəlməsidir. Bu kəlmənin açıq forması belədir اال اان .

Məddi-lazımda hərfi-məddən sonra səbəbi-məddən sükunu lazım gəldiyi halda, tərifindəki eyni kəlmədə gəlmə şərtı hasil olmayıb ayrı-ayrı kəlmələrdə gələrsə məddi-lazım olmaz. misal: قالُوا الْآنَ

Mədd-i lazımın hökmü vacibdir. Müttəfəqün əleyh (üzərində ittifaq ) olduğu üçün 4 əlif miqdarı uzadılır. Müsəqqələ ilə müxəffəfəni bir-birindən ayıran mühim yol; müsəqqələlərin şəddəli, müxəffəfələrin şəddəsiz olmasıdır. Hərfin oxunuşunda şəddə meydana gəlirsə müsəqqələ, yalnız cəzm meydana gələrsə müxəffəfə olur. Bu metod kəlmələrdə də hərflərdə də əsas alınır.

**ç. Məddi-Ariz**

Hərfi-məddən sonra səbəbi-məddən sükunu-ariz gələrsə məddi-ariz olur. Sükunu arizin nə olduğunu bir daha söyləsək; durulduğunda ortaya çıxan, keçildiyində yəni vəsl edildiyində isə ortadan qalxan sükuna, arizi sükun ya da sükunu-ariz deyilir. Ümumiyyətlə ayə sonlarında və ya vəqflərdə, səcavəndlərdə, hərəkəli olan kəlmələrdə durulduğunda meydana gəlir. Məddi-ariz olması üçün hərfi-məddən sonra sükunu-ariz gəlməsi lazımdır. Bir xüsusa diqqət edilməlidir ki hər məddi-arizdə bir sükunu-ariz vardır. Lakin hər sükunu- arizdə məddi-ariz yoxdur.

Misallarla izah edəsi olsaq: رَبِّ الْعَالَمِينْ kəlməsinin son hərəkəsi əslində fəthədir. Fəqət bu kəlmənin sonunda durulduğunda ən sonda olan hərfin hərəkəsini sükunlu oxumalı oluruq. Bu vəziyyət hərfi məddən sonra gəldiyi üçün, yəni mim hərfini uzadan "yə" dən sonra gəldiyi üçün mədd-i ariz olmuşdur.

Məddi-arizin oxunuşu; oxunan hərfin hərəkəsinə görə dəyişir. Bu oxunuş şəkillərinə vücüh və ya vücühat deyilir. Bunlar sırasıyla; tül, təvəssüt və qəsrdir.

Tül uzun oxuma deməkdir və bu oxumada məddi-ariz dört əlif miqdarı uzadılır. Təvəssüt, orta oxunuş deməkdir və məddi-ariz bu oxunuşda iki ya da üç əlif miqdarı uzadılır. Qəsr isə qısa oxumaq mənasına gəlməklə birlikdə bir əlif miqdarı uzadılır. İndi isə son hərfin hərəkəsinin halına görə bu vəcihlərdən hansılarının caiz olacağını incələyək.

1) Hərfi-məddən sonra gələn və üzərində vəqf edilən kəlmənin, yəni məddi-ariz olan kəlmənin son hərfinin hərəkəsi üstün isə; يُكَذِّبُونْ misalında olduğu kimi, tül (4-5 əlif), təvəssüt (3 əlif) və qəsr (1 əlif) olmaq üzərə 3 vəcih caizdir.

2) Durulduğunda məddi-ariz olan kəlmənin son hərfinin hərəkəsi

əsrə olursa, 4 vəcih caizdir. Bunlar tül, təvəssüt, qəsr və qəsr ilə rəvmdir. يَوْم الدِّين misalında son hərf olan "nun" hərfinin hərəkəsi kəsrədir. Bu şəkildə, bu hərfdən sonra dayanıldığında yenə məddi-ariz olur. Fəqət belə olduqda digər üç vəcihə əlavə olaraq rəvm ilə oxumaq da caizdir.

Rəvm: Son hərfin hərəkəsinin gizli səslə, yəni tam səsinin üçtə biri ilə ifadə edilməsidir. Yəni duracağımız zaman, son hərfin hərəkəsini çox xəfif bir səslə müəyyən etməkdir. Təcvid elmində belə tərif olunur.

اَلرَّوْمُ: طَلَبُ الْحَرَكَةِ بِصَوْتٍ خَفِيٍّ

Rəvm vəsl hökmündə olduğu üçün yalnızca qəsr ilə edilir. Çünki gizli səslə də belə olsa hərəkə ifadə edildiyi zaman səbəbi-məd olan sükun ortadan qalxar. Səbəbi-məd olmadığı zaman da yalnız məddi-təbilik qalır. يَوْم الدِّين إِيَّاك ayəsini oxuduğumuzu düşünək. Buradakı vəsl, yəni الدِّين kəlməsindən إِيَّاك yə keçərkən د hərfini bir əlif miqdarından çox uzalda bilməməyimizin səbəbi, (ن) nunun hərəkəsinin ifadə edilməsi səbəbilə səbəbi-məd olmaqdan çıxmasıdır. Rəvmdə (ن) nunu -gizli səslə olsa belə- hərəkəsilə birlikdə oxuduğumuz üçün səbəbi-məd olmaz. Onun üçün rəvm qəsr ilə edilir, mədlə deyil. Əlavə olaraq qeyd etmək lazımdır ki, rəvm ancaq qəsr ilə olur. Bunlar ancaq, bu işin əhli olan bir mütəxəssisin ağzından (fəmi-mühsin) eşidilərək öyrənilə bilər.

Qurani-Kərimdə Həfs rəvayətinə görə rəvm yoxdur. Ancaq görmə özürləri olanlara, üzərində vəqf edilən hərfin hərəkəsini bildirmək üçün edilir. Namazda və vird oxuyarkən rəvmin edilməsi məkruhdur. Demək ki, rəvm təlim-tərbiyə üçün edilir. Rəvm məddi-ariz və məddi-lin olan vəqflərdə edildiyi kimi məd olmayan vəqflərdə də edilir.

3) Kəlmənin son hərfinin hərəkəsi ötrə isə نَسْتَعِينُ kimi 7 vəcih caizdir: Tül, təvəssüt, qəsr, qəsr ilə rəvm, tül ilə işmam, təvəssüt ilə işmam, qəsr ilə işmam.

İşmam, sükundan sonra dodağı yummaqdır:

اَلإِشْمَامُ اِنْضِمَامُ الشَّفَتَيْنِ بَعْدَ السُّكُونِ

Yəni, sakin hərfin səsi bitdikdən sonra dodaqlar yumulur. Sakinin səsi bitmədən yumularsa tərifə uyulmamış olunur ki, bu da caiz deyildir. Başqa bir

ifadə ilə işmam; sükundan sonra dodaqları irəliyə doğru çəkərək yummaqdır. İşmam sadəcə zəmmə yəni ötrəyə məxsusdur. İşmamda səs yox, şəkil əsasdır. Rəvmdə isə səs var şəkil, görünüş yoxdur.

Həfsa görə işmam da rəvm kimi təlim-tərbiyə üçün vəqflərdə, eşitmə özürləri olanlara kəlmənin son hərfinin hərəkəsinin ötrə olduğunu bildirmək üçün edilir. Ancaq Yusuf surəsinin 11-ci ayəsində yer alan (لَا تَأْمَنَّا) kəlməsindəki işmamı Əbu Cəfər xaric doqquz qiraət imamı işmam vəchi ilə də oxuduğuna görə, bu kəlmənin işmam vəchini namazda və virddə oxumaq caizdir. Bu kəlmənin əsli (لَا تَأْمَنُنَا) dir.[19]

Mövzunu qısa bir şəkildə xülasə edə bilərik. Kəlmənin axırı (sonu) məftuh olarsa yalnız məd vəcihləri vardır; işmam ya da rəvm yoxdur. Kəlmənin sonu məksür (əsrə) olarsa, məd ilə rəvm vardır. Kəlmənin sonu məzmum (ötrə) olarsa mədlə bərabər həm işmam, həm də rəvm vardır.

İşmam ilə rəvm arasında bəzi fərqliliklər mövcuddur.

a. Kor olanlar rəvmi eşidərlər fəqət işmamı görə bilməzlər

b. Rəvm kəlmənin sonunda olduğu halda, işmam kəlmənin başında, ortasında və sonunda ola bilir.

c. İşmam həm sakin, həm də hərəkəli hərflərdə ola biləcəyi halda, rəvm isə sadəcə sakin hərflərdə olur.

Məddi-arizin hökmü caizdir. Caiz olmasının səbəbi səbəbi-məddin sükunu-ariz olmasıdır. (Bir məddin hökmü caiz isə o məddə qəsr vəchinin də var olduğu anlaşılır.)

**DİQQƏT:** (يَشَآءُ - اَلسُّفَهَآءُ) kimi kəlmələrdə vəqf edildiyi zaman sükunu-ariz meydana gəlir. Bunlar məddi-ariz olurmu?-Sondakı həmzələr hərfi-məddən sonra gəldikləri üçün səbəbi-məddir. Burada iki səbəb (həmzə və sükun) cəm olmuş, bu iki səbəbdən biri olan həmzə səbəbi-qəvi (gülcü səbəb)

---

[19] Yusuf surəsindəki لَا تَأْمَنَّا kəlimməsini, Ebu cəfər xaric digər bütün qiraət imamları iki vəcihlə oxumuşlar. Sadəcə Ebu Cəfər idğam ilə oxumuş, burada rəvm və işmam etməmişdir.

olduğundan, bu kəlmələrdəki mədlər məddi-ariz deyil, məddi-müttəsildir. Yəni bu kəlmələrin vəqfləri də vəslləri kimi məd edilir, qəsr ilə oxunmaz.

Rəvm və işmamın faydalarını belə açıqlamaq olar: üzərində vəqf edilən hərfin əsl hərəkəsini dinləyənə və ya bu hərəkəyə baxana, hərəkənin cinsini yəni nə olduğunu açıqlamaqdır. Bundan da başa düşüldüyü kimi, rəvm və ya işmam ilə vəqf etmək, qiraəti dinləyən kimsənin hüzurunda olur və belə olduqda gözəl görülür. Əgər oxuyan kimsə öz başına oxuyursa və başqa dinləyən kimsə yoxdursa bunlara da ehtiyac yoxdur.

**d. Məddi-Lin**

Lin ( اللين ) lüğətdə yumuşaq olmaq deməkdir. Lin hərflərilə əlaqəli məlumat 26-cı səhifədə verilmişdir. Hərfi lindən sonra sükun gələrsə məddi-lin olur. Daha geniş bir şəkildə izah ədəcək olsaq; “vav və yə” ( و- ى ) hərfləri sakin olub, özlərindən öncəki hərfin hərəkəsi məftuh (fəthəli), özlərindən sonraki hərf isə sükunlu olarsa belə olduqda məddi-lin olur. Vəqf halında oxunan قُرَيْشْ وَالصَّيْفْ الْبَيْتْ خَوْفْ غَيْرْ kəlmələrini nümunə olaraq göstərə bilərik. Bu kəlmələrdə açıq olaraq görüldüyü üzərə “vav ilə yə” hərflərinin özləri sakin əvvəlləri üstünlü, özlərindən sonraki hərflər də sakindir. Gördüyümüz kimi belə olduğu halda mədd-i lin olur.

Məddi-linin mərtəbələri mövcuddur. Bu mərtəbələr lin hərfindən sonra gələn sükunun lazımi ya da arizi olmasına görə dəyişə bilir. İndi sırasıyla bunları izah edək.

a. Lazımi sükun olarsa: əgər lin hərfindən sonra gələn sükun, lazımi sükun isə bu durumda iki vəcih caizdir. Bunlar tül (üç əlif) və təvəssütdür (iki əlif). Fəqət qaydaların hamısını nəzərə aldıqda bu kimi hallarda tül ilə oxumaq daha fəzilətlidir.

Səbəbi-məddi sükunu lazım olan məddi-lin Qurani-Kərimdə iki yerdədir. Məryəm surəsinin başındakı hürufül-müqəttəədən olan كهيعص kəlməsini açaraq incələdiyimiz zaman كَافْ هَا يَا عَيْنْ صَادْ şəklində qarşımıza çıxır. Bu açılmış formada altı cızılı olan ifadənin sükunu lazımidir. “yə” hərfi sakin özündən öncəki hərf məftuh olduğu üçün də bu hərf lin hərfi sayılır. Bu lin hərfindən sonra gələn hərfin üzərindəki sükun, lazımi olduğu üçün burada iki vəcih caizdir.

Belə olan ikinci misal da Şura surəsinin başında yer alan عسق kəlməsidir. Yuxarıda olduğu kimi bunu da açacaq olsaq; قَافْ سِينْ عَيْنْ şəklində ortaya çıxar. Yenə buradakı altı cızılı olan ifadə yuxarıda anlatdığımız vəziyyətlə eynidir.

b. Arizi sükun olarsa: məd səbəbi olan sükun, əgər arizi olarsa, bu halda məddi-linin mərtəbəsi, məddi-arizdə olduğu kimi arizi sükunun yer aldığı hərfin əsl hərəkəsinə görə dəyişir.

1) Kəlmənin sonu üstün olarsa üç vəcih caiz olur. Misal: (غَيْرَ) Bunda yalnız (üç vəcih) məd halı vardır: Tül (4 əlif), təvəssüt (3 əlif), qəsr (1 əlif).

2) Kəlmənin sonu əsrə olarsa dört vəcih caiz olur. Misal: (وَالصَّيْفِ) Bunda məd və rəvm halı vardır. Bilindiyi kimi rəvm yalnızca qəsr ilə edildiyinə görə cəmi dörd vəcih olmuş olur: Tül, təvəssüt, qəsr, qəsr ilə rəvm.

3) Kəlmənin sonu ötrə isə yeddi vəcih caizdir. Misal (اَلْخَيْرُ) Bunda məd, rəvm və işmam olmaq üzərə üç hal vardır: Tül, təvəssüt, qəsr, qəsr ilə rəvm, tül ilə işmam, təvəssüt ilə işmam, qəsr ilə işmam. Burada isə gördüyümüz kimi yeddi vəcih mövcuddur.

Məddi-lində digər mədlərdən fərqli olaraq uzadma lin hərfi üzərində olur. Yəni digər mədlər, məd hərflərindən öncəki hərfin hərəkəsindən asılı olduğu üçün, hərfi məddlərdən öncəki hərfdə meydana gəlirlər. Məddi-lində isə məd bir başa lin hərfinin özündə, məxrəcində icra edilir. Məsələn: الْبَيْتِ kəlməsi ***"əl-beyyyt"*** şəklində oxunur.

Məddi-lində məd ölçüləri, digər mədlərə nəzərən biraz daha əksik qəbul edilmişdir. Hətta bəzi müəlliflərə görə məddi-linə bu ismin verilməsi, digər məd hərflərinə nisbətlə, lin hərflərinin mədlərinin az oluşu və özlərindən öncəki hərfin hərəkəsinin də öz cinsindən olmaması səbəbinə dayanır. Bunda tül üç əlif, təvəssüt iki əlif, qəsr isə bir əlifdir.

Məddi-linin hökmü caizdir. Çünki bu məd qiraət alimləri arasında müxtələfün fihdir (üzərində ixtilaf edilən). Yeri gəlmişkən onu da qeyd etmək lazımdır ki, məd səbəbi olmadan sadəcə lin hərfinin üzərində məd emək xatadır. Və caiz deyildir. اِلَيْهِمْ - خَوْفِهِمْ misallarında olduğu kimi.

## C. MƏD MÖVZUSUNDA DİQQƏT EDİLMƏSİ LAZIM OLAN MƏQAMLAR

Qurandakı mədləri oxuyarkən bəzi xüsuslara diqqət etməliyik. Bu xüsuslar oxuyucunun qiraətinin düzgün olması və mənanın doğru olması üçün son dərəcə mühimdir. Bunları bir neçə maddə halında izah etmək mümkündür.

1. Qurani-Kərimi oxuyarkən mədlər, oxunuş sürətinə uyğun olmalıdır. Məddin dəyərləndirilməsində əsas alınan ölçü hərəkə olduğuna gorə, məddə verilən zaman miqdarı hərəkəyə gorə olmalıdır. Əgər buna diqqət etməsək, məsələn hədr oxuyarkən mədləri təhqiqə görə oxusaq, düzgün bir oxunuş etməmiş olarıq. Bu vəziyyət, xüsusilə ramazan aylarında təraveh namazı qıldırılarkən ya da xətim oxunarkən və yaxud da müəzzinlik edilərkən gözə çarpır.

2. Mədlər ancaq mütəvatir qiraətlərin özlərinə isnad edildiyi qiraət imamlarından nəql edilən mərtəbələrə görə oxuna bilər. Mütəvatir qiraətlərin vəcihlərindən olan məd miqdarları, içtihadi bir məsələ olmadığı üçün uzadma miqdarını düzgün tətbiq etmək zəruridir. Bu həqiqəti belə izah etmək mümkündür: Quran oxuyan kimsə, hansı imamın qiraətini oxuyursa, o imamın bütün oxunuş şəkillərinə (vücühatlarına) tabe olmaq məcburiyyətindədir. Məsələn: Asim qiraətini oxuyan bir kimsənin, məddi-müttəsil ya da məddi-münfəsili dörd əlifdən daha çox və ya daha az oxumaması lazımdır. Əgər əksi olarsa, qiraətlər bir-birinə qarışmış olar. Bu şəkildə oxuyan biri nə öz qiraət imamının qiraətini nə də başqa bir qiraət imamının qiraətini oxumuş olar. Belə halda vəcihlər bir-birinə qarışmış olar.

Fəqət qiraət elmində rühsət sahibi olanlar, bütün vəcihlərini yerinə yetirmək surətilə istədikləri imamın və ya imamların qiraətlərini oxuya bilərlər.

3. Quran oxuyan kimsə, mədlərdə imamının oxuduğu bütün mərtəbələri oxuya bilər. Hətta caiz gördüyü mərtəbələrdən hər hansı birini də seçə bilər. Məsələn: Asim qiraətinin Həfs rəvayətini oxuyan bir kimsə müttəsil, münfəsil və lazım mədləri dörd əlif miqdarı oxumaq məcburiyyətindədir. Fəqət məddi-arizi yerinə görə dörd əlifdən bir əlifə kimi oxuya bildiyi halda, caiz görülən digər oxunuş şəkillərinindən hansını istərsə onu da seçə bilər.

4. Mədləri oxuyarkən təğənni yəni məqam etmək və ya oxunuşdakı ahəngi pozmaq qorxusu, mədlərin mərtəbələrinə uyğun bir tərzdə oxunmasına mane olmamalıdır. Məsələn: hər hansı bir məqamı edə bilmək, mədlərdə bir dəyişikliyə səbəb olacaqsa əvvəlcə təcvid qaydasi düşünülməli, səs və məqam bu qaydaya uyğun edilməlidir.

5. Bəzi zərurətlərə görə oxunması caiz görülən qərib qiraətləri oxuyarkən son dərəcə diqqətli hərəkət edilməlidir. Məsələn: məddi-ariz və məddi-linlərdəki rəvm və işmamlı oxumaq kimi. Quran oxuyan kimsə, Quran dinləyicilərinin elmi dərəcələrini (bilgisizliklərini) də düşünməli və fitnəyə səbəb olmaqdan uzaq durmalıdır.

## IV. İDĞAM VƏ İDĞAMLA ƏLAQƏLİ MƏSƏLƏLƏR

### A. İDĞAM HAQQINDA ÜMUMİ MƏLUMAT

İdğam "إدغام" kəlməsi lüğətdə bir şeyi bir şeyin ucuna qatmaq, daxil etmək mənasına gəlir. Təcvid elmində isə belə tərif edilir:

الاِدْغام إدْخالُ احدِ الحَرْفِين المُتَمَاثِلَين او المُتَجانِسَيْنِ او المُتَقَارِبَيِنِ في الآخِر

"*iki mütəməsil (bir-birinin eyni) və ya mütəcanis (eyni cinsdən) və yahud da mütəqərib ( yaxınlığı olan) hərfdən birincisini digərinə daxil etməyə idğam deyilir.*"

Mütəməsil, mütəcanis və ya mütəqərib olan iki hərf yan-yana gəldikləri zaman birinci hərf ikinci hərfə idxal edilir. Yəni birinci hərf ikinci hərfin cinsinə çevirilir və şəddəli hərf kimi oxunur.

إرْكَبْ مَعنَا = إركَمَّعَنَا     يُدْرِكْ كُمْ = يُدْرِكُّمْ     يَلْهَثْ ذَلك = يَلْهَذَّلكَ

Misallarında yuxarıda verdiyimiz məlumatlar görünür. İdğam bu şəkildə edilir: sakin olan birinci hərfin məxrəci üzərinə qüvvətli bir şəkildə dayanmaq və məxrəcdə səsi, bir hərfin səsi kimi duyuluncaya qədər saxlamaqdır.

Bu idğam səbəbilə meydana gələn şəddəli hərfin tələffüz müddəti (tutulma müddəti) sükunlu bir hərfin zamanından daha uzun, iki sükunlu hərfin zamanından daha qısadır. Lakin onu da qeyd etmək lazımdır ki, bu ifadə

günnəsiz idğamlara məxsusdur. Ğünnəli idğamların zamanı daha uzundur. Bu mövzu daha sonra ətraflı bir şəkildə izah ediləcək.

İdğamda iki mühim ünsür mövcuddur. Müdğam və müdğamün fih. Özündən sonra gələn kəlməyə idğam edilən birinci sakin hərfə müdğam deyilir. İdğamın öz üzərində icra edildiyi ikinci və hərəkəli olan hərfə də müdğamün fih deyilir.

İdğam ola bilməsi üçün bəzi şərtlər mövcuddur.

a) Müdğam ilə müdğamün fihin yazıda yan-yana olması və araya har hansı bir hərfin girməməsi lazımdır. Müdğam ilə müdğamün fihin eyni kəlmə içərisində olması ya da ayrı kəlmələrdə olması mümkündür.

b) Müdğam sakin, müdğamün fih isə hərəkəli olmalıdır.

c) Müdğam məd hərflərindən biri olmamalıdır. الذى يُوَسْوِسُ ya da امَنُوا وَعمِلُوا misallarında hər iki ifadədəki ilk kəlmənin son hərfləri hərfi məd olduğu üçün burada idğam yoxdur.

İdğamın üç səbəbi var. Bu səbəblər eyni zamanda idğamın tərifini verərkən də keçmişdir. Bunlar sırasıyla təməsül, təcanüs və taqərübdür. Bir sonrakı başlıqda ətraflı olaraq izah ediləcəkdir.

İdağmın faydasını belə xülasə edə bilərik: idğam tələffüzdə asanlıq meydana gətirir. Çünki Quran oxuyan idğam sayəsində iki hərf tələffüz etmək yerinə tək hərf oxumuş olur.

Tətbiqat baxımından idğamlar tam idğam və naqis idğam olmaq üzərə iki qismə ayrılır.

A) Tam idğam: Əgər idğamda müdğam olan birinci hərf, zatı və sifətları etibarilə müdğamün fih olan ikinci hərfdə tamamilə itib özündən heç bir iz qalmazsa bu tam idğam olur. وَدَّتْ طائِفَةٌ və إ ذْ ذَهَبَ misallarında tam idğam açıq olaraq görünür. Birinci misalda ت hərfi özündən sonra gələn ط hərfində, ikinci misalda isə ذ hərfi, özündən sonra gələn ظ hərfində tamamilə itmiş və bu şəkildə tam idğam olmuşdur.

B) Naqis idğam: Əgər idğamlı oxunuşda müdğam olan birinci hərf, müdğamün fih olan ikinci hərfdə zatı etibarilə itib, fəqət idğama mane

olmayan bir sifətinin qalmasıyla özünü hiss etdirirsə bu idğama naqis idğam deyilir. بَسَطْتُ – اَحَطْتُ - مَنْ يَعْمَل Burada sükunlu olan müdğam yəni birinci hərflər, müdğamün fih olan ikinci hərfin içərisində qismən itdiyinə görə idğam naqisdir.

Bir idğamın tam ya da naqis edilməsi mövzusunda əsas alınan qayda budur: İdğamda qüvvətli olan hərfə etibar edilir. Zəyif olan hərf qüvvətli olan hərfə idğam edilir. Müdğam olan birinci hərflə müdğamün fih olan ikinci hərfin hər ikisi də incə ya da hər ikisi də qalın sifətlidirsə idğamın tam olması xüsusunda hər hansı bir müşkül yoxdur. Lakin müdğam və ya müdğamün fihdən biri incə digəri qalın sifətli isə, idğam qüvvətliyə görə edilir. إِذْ ظَلَمُوا misalında müdğam olan ذ hərfi incə (zəyif), müdğamün fih olan ظ hərfi isə qalın (qüvvətli) bir hərfdir. Zəyif hərf qüvvətli hərfə idğam edildiyi üçün birinci hərf ikinci hərfə tabe olmaq məcburiyyətindədir.

Hərflərin sifətlərini bir daha xatırlayaraq tam və naqis idğamı daha yaxşı anlamağa çalışaq.

1) İtbəq: ص ض ط ظ

2) İstila: ق غ خ (istilai-lazimə) ر ل (istilai-arizə)

3) İstifalə: ا ب ت ث ج ح د ذ ر ز س ش ع ف ك ل م ن و هـ ى

Bu sifətlərə görə idğamlara tam və naqis olmaları etibarilə bir daha nəzər salaq:

a) İtbəq hərfinin itbəqə idğamı tam idğamdır.

b) İstila hərfinin istila hərfinə idğamı tam idğamdır.

c) İstifalə hərfinin istifalə hərfinə idğamı tam idğamdır.

ç) İstifalə hərfinin itbəq hərfinə idğamı tam idğamdır.

d) İtbəq hərfinin istifalə hərfinə idğamı naqisdir. Həm də naqislik hökmü vacibdir. Misal: (فَرَّطْتُ) kimi. Burada itbəq sifəti çox qalın olduğundan istifalə hərfi olan (ت) nin bunu gizlətməsi mümkün deyildir.

e) İstila hərfinin istifalə hərfinə idğamının tam və ya naqis olması caizdir.

Misal: أَلَمْ نَخْلُقْكُمْ Əgər bu kəlmədə qəlqələ ağla gəlirsə, bilinməlidir ki, idğam qəlqələdən əvvəldir. İdğamın tam olması (ق) ilə (ك) arasındakı məxrəc yaxınlığına görədir. İdğamın naqis olması, (ق) ın istila hərfi (qalın), (ك) in istifalə hərfi (incə) olmasına görədir. (ق) hərfinin (ك) də zatı və sifəti ilə gizlənməsinə tam idğam, (ق) ın istila sifətinin aşkar edilərək zatının (ك) də gizlənməsinə naqis idğam deyilir. Beləcə bu kəlmənin idğamının həm tam, həm də naqis olması caiz olur.

## B. İDĞAMIN NÖVLƏRİ

Hərflərin bir-birlərinə idğam edilib edilməyəcəyi, məxrəcləri və sifətlərinin bir-birlərinə yaxınlığı ilə əlaqəlidir. Başqa bir ifadə ilə; məxrəc və sifətləri yönündən bir-birinə yaxın olan hərflər idğam edilir. Məxrəc yönündən bir-birinə uzaq olan hərflər və sifətləri yönündən bir əlaqəsi olmayan hərflər isə ızharlı oxunurlar. Bu mövzunu gələcək bölmələrdə izah edəcəyik.

Bu əsaslardan yola çıxaraq idğamları "idğami-misleyn, idğami-mütəcaniseyn və idğami- mütəqəribeyn" olmaq üzərə üç qisimdə izah edəcəyik.

### 1. İdğami-Misleyn ( إدغام المثلَين )

Mövzuya keçmədən öncə misleyn hərfini tərif edək.

Hərfi-misleyn ( misleyn hərf) مااتَّحدا مخرَجاً و صفةً "*məxrəcləri və sifətləri eyni olan iki hərfə"* deyilir.

İdğami-misleyn isə, məxrəcləri və sifətləri eyni olan iki hərf birincisi sakin, ikincisi isə hərəkəli olaraq yan-yana gələrsə, sakin olan birinci hərfin hərəkəli olan ikinci hərfə idğamına deyilir.

İdğami-misleyndə, müdğam ilə müdğamün fih eyni kəlmələrdə ola biləcəyi kimi ayrı-ayrı kəlmələrdə də ola bilər. Eynı kəlmədə olsalar tək hərf ilə şəddəli şəkildə yazılır. الحُرُّ بالحُرِّ - اَشَدُّ حُباً - كُرسِيُّهُ

Bir-birinə bitişik ayrı kəlmələrdə olsalar, ayrı-ayrı yazılırlar. عَنْ نَفْسٍ - وقُلْ لَهُمْ - و قَدْ دَخلوُا. Müdğamün fih əgər zəmir isə yenə eyni

kəlmə içərisində yazılır. Məsələn: وَمَنْ يُكْرِهْهُنَّ - يُدْرِكْكُمْ

İdğami- misleyn iki qismə ayrılır:

1) Ğünnəli idğami-misleyn: Sakin “nun” hərfindən sonra hərəkəli “nun”, sakin “mim” hərfindən sonra hərəkəli “mim” hərfi gəldiyində ğünnəli idğami-misleyn olur.[20]

Məsələn: وَمَنْ نُعَمِّرْهُ - مِنْ نَارٍ - مَنْ نَشَاءُ

فَأَمَّاً - وَهُمْ مِنْ - عَلَيهِمْ مُؤْصَدَة

“Mim və nun” hərflərinin idğamında ğünnə sifəti olduğundan bunların idğamında ğünnənin ortaya çıxması üçün, digər hərflərin idğamına nəzərən biraz daha çox tutulmalıdır.

2) Ğünnəsiz idğami-misleyn: “Nun və mim” hərflərindən başqa digər hərlərin eyni şərtlər altındakı idğamına deyilir. Misal: بَلْ لَجُّوا- قَدْ دَخَلُوا kimi. Bu növ idğamda ğünnə olmadığı üçün gənizdən səsin gəlməməsinə diqqət etmək lazımdır. Bunun ən gözəl ölçüsü də bu növ hərfləri idğam ilə oxuyarkən burnu tutmaqdır. Əgər burundan səs gəlirsə ğünnəli idğam olur. Halbuki bu növ hərfləri idğamlı oxuyarkən səs sadəcə ağızdan gəlməlidir.

**2. İdğami-Mütəcaniseyn ( إدغام المتجانثين )**

Mütəcaniseyn hərf; ما اتّحدا مَخْرَجاً و اخْتَلَفا صِفَةً tərifdə də qeyd edildiyi kimi məxrəcləri bir, fəqət sifətləri fərqli olan iki hərf deməkdir.

İdğami-mütəcaniseyn isə, mütəcanis ( yəni məxrəcləri bir sifətləri fərqli olan) iki hərfdən birincisi sakin, ikincisi isə hərəkəli olduğu halda yan-yana gəlməsilə meydana gələn idğama deyilir.

Burada onu da qeyd etmək lazımdır ki, məxrəcləri bir olan hərflərin

---

[20] Nun sakin Nuna rastlayarsa həm idğam misleyn, həm də idğam məal-ğünnə olur. Səbəbi isə idğam misleyn babının qaydasının idğam məal-ğünnə babının qaydası ilə nunda üst-üstə düşməsidir. Bunun üçün sakin nun hərəkəli nuna rastladığı zaman iki babın hökmünə birdən girir. Bundan dolayı nunun misleyninə həm idğam misleyn, həm də idğam məal-ğünnə deyirik.

bir-birlərinə idğam edilib edilməməsi, qiraət imamları arasında ixtilaflı bir mövzudur. Biz burada sadəcə Asim qiraətinin Həfs rəvayətindən bəhs edəcəyik.

Asım qiraətinin Həfs rivayətinə görə mütəcaniseyn hərflər üç qrupa ayrılır.

1) ط - د - ت

Bu üç hərf öz aralarında idğam olunurlar. مَا عَبَدْتُمْ / أَثْقَلَتْ دَعَوَ اللهُ misallarında bu hərflər bir-birlərinə idğam edilmişdir. Burada eyni zamanda tam idğam vardır. Müdğamın qalın hərf olduğu اَحَطْتُ – بَسَطْتَ kimi kəlmələrdə də görüldüyü üzərə ط hərfinin itbəq və istila sifətlərini göstərmək üçün, idğama mane olan qəlqələ sifətini tərk etmək mövzusunda qiraət alimlərinin ittifaqı vardır. Yəni bu kəlmələrdəki ط hərfi üzərində əsla qəlqələ edilməz. Burada naqis idğam olur.

2) ظ - ذ - ث

Bu üç hərf də öz aralarında idğam olunur. اِذْ ظَلَمُوا misalındakı ذ hərfinin ظ hərfinə idğamı Quranda sadəcə bir yerdə keçir. Bu iki hərfin, bir-birinə tam idğamla idğam edilməsində ittifaq vardır. ذ hərfinin ث hərfinə idğamına aid Quranda hər hansı bir nümunə yoxdur. ث hərfinin ذ hərfinə idğam edilməsinin Qurandakı tək misalı əl-Əraf Surəsinin 176-cı ayəsində keçən يَلهثْ ذلك ifadəsidir.[21]

3) ب və م

Bu hərflərin idğam ola bilməsi üçün ب hərfinin öncə, م hərfinin isə daha sonra gəlməsi lazımdır. Belə olduqda idğami-mütəcaniseyn olur. Bu iki hərflə olan mütacaniseyn idğam sadəcə Hüd surəsinin 42-ci ayəsində keçən اِرْكَبْ معنا. kəlməsindədir. Bu kəlmədə ب hərfi م hərfinə idğam edilmişdir. Bundan dolayı da bu kəlmə yuxarıdakı şəkildə yazıldığı halda oxunuşu اِرْكَمْ مَعَنَا şəklindədir. Yəni müdğam olan sakin hərf, müdğamün fih olan hərəkəli hərfin cinsinə çevrilir və müdğamün fih şəddəli kimi oxunur.

---

21 يَلهثْ ذلك kəlməsi Asim rəvayətində həm idğamlı, həm də izharlı olaraq rəvayət edilmişdir. Fəqət idğamla rəvayəti və oxunması daha çox məşhurdur.

Əgər bunun ziddi olarsa, yəni م hərfi ب hərfindən daha öncə gələrsə idğami-mütəcaniseyn deyil, ixfai-şəfəvi (dodaq ixfası) olur. Bunu daha sonra ixfa mövzusunda izah edəcəyik.

**3. İdğami-Mütəqəribeyn ( اِدْغام المُتَقارِبَين )**

Tərifi, ما تَقارباَ مَخْرَجاً او صِفَةً او مخرجاً و صِفَةً məxrəcləri və ya sifətləri ya da həm məxrəcləri, həm də sifətləri bir-birinə yaxın olan iki hərfin yan-yana gəldikləri zaman, sakin olan birinci hərfin hərəkəli olan ikinci hərfə idğam edilməsinə deyilir.

Tərifdən də başa düşüldüyü kimi müdğam ilə müdğamün fih arasında məxrəc və ya sifət ya da hər iki cəhətdən bir yaxınlığın olması şərtdir. İmam Asimə görə mütəqəribeyn olan hərfləri iki qrupda toplaya bilərik.

1) ر - ل

Bu iki hərf arasında həm məxrəc, həm də sifət baxımından yaxınlıq var. Hər ikisinin də məxrəcləri bir-birinə yaxın olmaqla yanaşı, sifət yönündən də cəhr, beyyinə, infitah, istifalə və tərqiq sifətlərində müştərəklik vardır. Lakin bu iki hərfin mütəqəribeyn idğam ola bilməsi üçün öncə ل hərfinin, sonra da ر hərfinin gəlməsi lazımdır. قُلْ رَبِّ - بَلْ رَفَعَهُ الله kəlmələrini misal vermək olar. Bu kəlmələr idğamlı olaraq belə oxunur: قُرَّبِّ - بَرَّفَعَهُ الله Əks təqdirdə yəni ر öncə , ل sonra gələrsə Quranda nümunəsi olsa da idğam edilməz. Çünki burada şərt yoxdur.

رَبَّناَ اغْفِرْلي - اَغْفِرْ لَناَ misallarında göründüyü kimi.

**QEYD:** İdğami-mütəqəribeyndə Mütəffifin surəsində olduğu kimi öncə ل sakin sonra ر gəldiyində, eyni kəlmədə səktə olarsa idğam düşər. Səktə tətbiq edilər. Yəni səktə gəldiyində idğam edilməz. كَلاَّ بَلْ سكته رانَ misalında olduğu kimi.

2) ك - ق

Bu hərflərlə edilən idğamın nümunəsi sadəcə əl-Mürsələt surəsinin 20-ci ayəsində keçən أَلَمْ نَخْلُقْكُمْ kəlməsidir. Buradakı ق hərfinin ك hərfinə idğamı xüsusunda qiraət alimləri ittifaq etmişlər. Fəqət bu idğamın tammı, naqismi

olduğu xüsusunda ixtilaf edilmişdir. Naqis idğam edilməsi caiz görülməklə yanaşı tam idğam edilməsi daha fəzilətli sayılmışdır.

## V. LƏMİ-TƏRİFİN ( ال ) OXUNUŞU

Ləmi-Tərif ilə əlaqəli iki mövzu mövcuddur. Bunlardan birincisi idğami-şəmsiyyə, digəri isə izhari-qəməriyyə. Bu iki mövzu, ərəbcədə mərifəlik ədatı olaraq bilinən və çox istifadə olunan ال birləşməsinin digər hərflərlə olan münasibətilə əlaqəlidir. ال birləşməsi özündən sonra gələn hərflərə ya idğam edilir ya da izhar ilə oxunur. İndi bu halları tək-tək incələyək.

### A. İDĞAMİ-ŞƏMSİYYƏ

Ləmi-tərif dediyimiz ال birləşməsindən sonra şəmsi hərflərdən biri gələrsə ləmi- tərifin ləminin bu hərflərə idğam edilməsinə, idğami-şəmsiyyə[22] deyilir. İdğami- şəmsiyyədəki idğam tam idğamdır və ل hərfi şəmsi hərflərdə tamamilə itir.

Şəmsi hərflər ( hürufu-şəmsiyyə) on dörd ədəddir. Bunlar;

ت ث د ذ ر ز س ش ص ض ط ظ ل ن

Bu hərflər yaddaşda daha rahat qalması və daha asan əzbərlənməsi üçün təcvid kitablarında belə yazılır:

تُبْ ـ ثُمَّ ـ دَعْ ـ ذَنْباً ـ رَمَى ـ زِدْ ـ سُمْعَةً ـ شِمْ ـ صَدْرَ ـ ضَيْفٍ ـ طَابَ ـ ظَنَّ ـ لَهُ ـ نَعَمْ.

Şəmsi hərflərin bu şəkildə əzbərlənməsi, tələbələrə də bu şəkildə əzbərlədilməsi, bu hərflərin hafizədə daha uzun müddət qalmasına köməklik göstərir. İndi bu misallarda keçən ال birləşmələrini özlərindən sonra gələn hərflərə idğam edərək oxuyaq:

اَلشَّمْسُ - وَالتِّينِ - الرَّحمن - الرَّحِيمُ - الثَّوَبُ - الدِّينُ

İdğami-şəmsiyyə də öz arasında iki qismə ayrılır.

[22] İdğami-şəmsiyyə, kəlimə etibarilə günəş idğamı deməkdir. Ləmi-tərif (ال)daki lamın idğami-şəmsiyyə hərflərinin yanında aşkara çıxıb oxunmaması günəşin ətrafında ulduzların görünməməsinə bənzədilərək bu hərflərə şəmsi hərflər deyilmişdir.

1) İdğami-şəmsiyyə məal ğünnə: bu idğam sadəcə ن hərfinə məxsusdur. ال dan sonra şəmsi hərflərdən “nun” gəldiyi zaman idğami-şəmsiyyə məal ğünnə (ğünnəli idğami-şəmsiyyə) olur. وَالنَّجْمِ - مِنَ النِّسَاءِ kimi.

2) İdğami-şəmsiyyə bilə ğünnə: ال dan sora “nun” xaric digər şəmsi hərflər gələrsə, idğami-şəmsiyyə bilə ğünnə (ğünnəsiz idğami-şəmsiyyə) olur. وَالرَّسُولُ - وَالطَّيْرَ kimi.

## B. İZHARİ-QƏMƏRİYYƏ

Ləmi-tərif dediyimiz ال birləşməsindən sonra qəməri hərflər gələrsə, ihzari- qəməriyyə olur. Belə olduqda ال ın “lə” si özündən sonra gələn qəməri hərflərə idğam olunmadan açıq oxunur.

Qəməri hərflər, şəmsi hərflərin xaricində qalan 14 hərfdir. Bu hərflər; أَبْغِ حَجَّكَ وَخَفْ عَقِيمَه kəlmələrindəki hərflərdir. Bu hərfləri açıq şəkildə belə yaza bilərik:

ا - ب - غ - ح - ج - ك - و - خ - ف - ع - ق - ي - م - هـ

lakin bu hərflər burada yazdığımız şəklilə, kəlmələr halında əzbərlənərsə yaddaşda daha asan və uzun müddət qalar.

وَالْفَجْرِ -وَالْقَمَرِ - وَالْعَصْرِ kəlmələrində izhari-qəməriyyə mövcuddur. Burada xatırlatmağımız lazım olan bir xüsus da budur. ال birləşməsinin başındakı “əlif” vəsl həmzəsi olduğundan, izharda və idğamda diqqətə alınmamışdır.

## VI. TƏNVİN VƏ SAKİN NUNUN HÖKÜMLƏRİ

Təcvid kitablarında tənvin, ـٍـً dir şəklində bəsit bir tərif vardır. Bu tərif, yazıdakı görüntünün tərifidir deyə bilərik. Əslinda tənvin, isim olan kəlmənin sonunda yer alan ن hərfini hərəkəyə çevirməkdir.

Misal: قَوْمُنْ = قَوْمٌ dur.

Bu tərif bilinmədiyi təqdirdə قَوْمًانِ الله kimi kəlmələri izah etmək mümkün olmaz. Sakin nun isə ədat olan kəlmənin sonunda yer alan və hətta yazıda olduğu kimi görünən nundur.

Misal: مَنْ - عَنْ kimi.

Yuxarıdakı قَوْمٌ kəlməsindəki nun ilə مَنْ - عَنْ də keçən nun arasındakı fərq budur: قَوْمٌ dakı nun hərəkəyə çevrildiyi zaman kəlmə pozulur. مَنْ - عَنْ dəki nun isə hərəkəyə çevrilərsə bu ədatlar pozulurlar. Buna görə də (yazıda) görüldüyü şəkil nəzərə alınaraq hər iki hal ifadə olunmaq üzərə "tənvin və sakin nun" deyilir.

Tənvin və ya nun-sakinin 5 halı vardır.

1. İxfa
2. İzhar
3. İqləb
4. İdğami-məal ğünnə (ğünnəli idğam)
5. İdğami-bilə ğünnə (ğünnəsiz idğam)

Bəzi təcvid alimləri iqləbi, ixfa içərisində tələqqi etmişlər. Bu səbəblə tənvin və sakin nunun hallarını beş deyil, dörd başlıq altında izah etmişlər. Təcvid alimlərinin çoxu isə iqləbi xüsusi bir mövzu olaraq izah etmişdirlər. Biz də burada iqləb üçün xüsusi bir başlıq ayırmışıq.




Babların xüsusiyyətlərinə keçmədən əvvəl bu mövzunu oxuyan kimsənin bu barədə üfqünün daha da genişləməsi məqsədilə belə bir cədvəl çəkilməsini uyğun gördük.

TƏNVİN VƏ SAKİN NUN

| | | |
|---|---|---|
| HƏRFLƏR | ت ث ج ذ ز س ش ص ض ط ظ ف ق ك | İXFA |
| HƏRFLƏR | أ ه ع ح غ خ | İZHAR |
| HƏRFLƏR | ى م ن و | İDĞAMİ-MƏAL GÜNNƏ |
| HƏRFLƏR | ل ر | İDĞAMİ- BİLƏ GÜNNƏ |
| HƏRFLƏR | ب | İQLƏB ƏLAQƏSİ |

**A. İXFA ( الـإخفاء )**

Lüğətdə örtmək və ya gizləmək mənalarına gəlir. Təcvid temrini olaraq isə belə tərif edilir.

اَلْاِخْفاَءُ : حاَلَةٌ بَيْنَ اَلْاِظْهاَرِ وَاْلاِدْغاَم عاَرِيَةُ عَنِ التَّشْدِيدِ مَعَ بَقاَءِ الْغُنَّةِ

İxfa, ixfa hərflərindən öncə tənvin və ya sakin nunu izhar ilə idğam arasında, şəddə etmədən, ğünnənin qalması şərtilə oxumağa deyilir. Bu və buna bənzər qaydalar, ən gözəl şəkildə, "fəmi-Mühsin" dediyimiz, gözəl oxuyanların ağzından öyrənilməlidir. İxfa dil ucu və çənə sərbəst buraxılaraq, nun məxrəcinə dəymədən, nunu gizləyərək və gənizdən gələn səs ilə yəni ğünnə ilə oxumaqdır.

Tənvin və ya sakin nundan sonra aşağıdakı kəlmə qrupunun kəlmələrinin ilk hərflərindən biri gələrsə ixfa olur.

Kəlmə qrupu:

صِفْ ـ ذاَ ـ ثَناَ ـ جُودَ ـ شَخْصٍ ـ قَدْ ـ سَماَ ـ كَرَماَ ـ ضَعْ ـ ظاَلِماً ـ زِدْ ـ تُقاَ ـ دُمْ ـ طاَلِباً ـ فَتَرَى.

(ص ـ ذ ـ ث ـ ج ـ ش ـ ق ـ س ـ ك ـ ض ـ ظ ـ ز ـ ت ـ د ـ ط ـ ف)

İxfa, dil ucu ağzın heç bir yerinə dəydirilmədən (boşluqda ikən) səsin xəfif şəkildə buruna göndərilməsi ilə edilir. İxfa edilərkən dilin ucu və ortası boşda qalmalı, üst damağa dəydirilməməlidir. Bundan əlavə "nun" hərfinin məxrəci tamamən ortadan qalxır. Alt çənə təbi halıyla qalmalıdır. İndi bu misalları qaydalara uyğun olaraq tətbiq edək:

اَنْتَ - اِنْ كُنْتُمْ - عَنْ صَلاَتِهِمْ - فَتْحٌ قَرِيبٌ - خاَلِداً فِيهاَ

İxfanın hökmü vacibdir. Yəni ixfa edilməsi lazım olan yerlərdə qəti olaraq bu qayda tətbiq edilməlidir. İxfa iki əlif miqdarından az, bir əlif miqdarından çox tutulmalıdır. İxfa edilərkən bir neçə xüsusa diqqət edilməlidir.

1) "Nunun" ixfasında "nundan" öncə bir məd hərfi olmamalıdır.

Misal: عَنْكُمْ kəlməsini oxuyarkən عَانْكُمْ şəklində uzadılmamalıdır.

2) Ğünnə tərk edilməməlidir. Fəqət ğünnə həddindən artıq uzadılmamalıdır.

3) Bütün ixfalar incədir. Xüsusilə ixfa edilən hərf qalın hərfsə oxuyan kimsə, ixfanı qalınlaşdırmaq kimi bir yanlışa düşə bilər. Bu qalın hərflər, ixfadan öncə və sonra da ola bilər. Hər iki vəziyyətdə də ixfa incə okunmalıdır. Məsələn: مَطَراً فَساَءَ - مِنْ قَبْلِ kəlmələrində birinci misalda tənvindən öncəki "ra" hərfi qalın olub arxasından ixfa hərflərindən "fə" gəldiyi üçün ixfa edilməlidir. Fəqət "ra" hərfi hər nə qədər qalın olsa belə ixfalar incə olacağına görə, burada da incə olmalıdır. İkinci misalda "sakin nundan" sonra qalın məxrəcli "qaf" hərfi mövcuddur. Bu hərfin qalınlığına aldanmadan, ixfa incə edilməlidir.

4) İhfa edilərkən, ixfanın müddəti tam olmadan sakin nun və tənvini təqib edən hərfə keçilməməlidir. Xüsusilə də tənvin və ya sakin nundan sonra ف gəlincə, ixfanın müddəti az edilərsə و hərfinin ortaya çıxması ehtimalı olduğuna görə diqqət edilməlidir. Məsələn: اَنْفُسكُمْ kəlməsində ixfa edilərkən, yuxarıda bəhs etdiyimiz şəkildə bir xata ortaya çıxa bilər.

Sakin م hərfindən sonra ب hərfi gəldiyi zaman dodaq ixfası (ixfayi-şəfəvi) olur. م hərfinin zatını tamamilə yox etmədən dodaqları bir-birinə çox sıxmayaraq م hərfinin özünü gizləmək surətilə oxumaqdır.

اِنَّ رَبَّهُمْ بِهِمْ - تَرْمِيهِمْ بِحِجاَرَةٍ misallarında ixfai- şəfəvi vardır.

**B. İZHAR (الاظها ر)**

Kəlmə etibarilə açıqlama, açıq oxuma, açıq olaraq bildirmə mənalarına

gəlir. Tənvin və ya nun sakini açıqca oxumaqdır. İki hərfin arasını yəni tənvin və nun sakini izhar hərfinə qatmadan ayrı-ayrı və açıq olaraq oxumaqdır.

Temrin olaraq isə belə tərif edilir: اَلإِظْهَارُ هُوَ الإِنْفِصَالُ تَبَاعُدًا بَيْنَ الْحَرْفَيْنِ . İki hərfin arasını bir-birindən uzaqlaşdıraraq ayırmaqdır. Tənvin və sakin nundan sonra boğaz hərfləri dediyimiz altı hərfdən biri gələrsə tənvin və sakin nun izhar ilə oxunur. Bu altı hərf aşağıdakı kəlmələrin ilk hərfləridir. اَللهُ - حَيٌّ - خالِقٌ - عَدْلٌ - غَنِيٌّ - هادِيا bunları belə də sıralaya bilərik:

ا ، ح ، خ ، ع ، غ ، هـ.

İndi misalları diqqətlicə oxuyaq.

اِنْ هِىَ- لِمَنْ خَشِىَ - مَثَلاً عَبْداً - غَفُورٌ حَلِيم. Bu misallara baxdığımızda tənvin və sakin nun hərfindən sonra yuxarıda saydığımız altı hərftən biri gəldiyi üçün bu hərflər heç tutulmadan, bir-birinə idğam edilmədən və araları ayırılaraq oxunur.

Qiraət alimləri arasında, izhar hərflərinin ilk dördü haqqında ittifaq vardır. Bu hərflər ء - ح - ع - ه dir. Bu hərflərdən öncə gələn tənvin və sakin nunun izharlı oxunması vacibdir. Geriyə qalan غ və خ hərflərində izhar etmək caizdir. Qiraət imamlarından Əbu Cafərdən başqa bütün imamlar bu hərflərdə də izhar etmişdirlər. Fəqət burada onu da qeyd etmək lazımdır ki, bu iki hərfdəki izharın vacib deyil, caiz olması tamamilə qiraət imamları arasındakı ixtilafdan meydana gəlir. Bu səbəblə biz Asim qiraətinin Həfs rəvayətini oxuduğumuza görə izhar etməyimiz şərtdir.

İzhar edilərkən səktə olmaması üçün diqqət edilməlidir. İzharda ğünnə yoxdur. Üzərində dayanılmaz. Yəni nun sakin və ya tənvin tam açıq olaraq oxunub izhar hərfinə keçilir.

**C. İQLƏB ( الاقلاب )**

Kəlmə olaraq çevirmək deməkdir. Tənvin və ya sakin nunu sakin mimə çevirmək və ب dən öncə ğünnəni hiss etdirərək oxumaqdır. Tam tərifi isə belədir:

اَلإِقْلاَبُ هُوَ قَلْبُ النُّونِ السَّاكِنَةِ أَوِالتَّنْوِينِ مِيمًا خَالِصًا وَإِخْفَاؤُهَا عِنْدَ الْبَاءِ بِغُنَّة

“ İqləb, sakin nunu və ya tənvini xalis mimə çevirmək və həmin mimi ixfa etməkdir”.

Bu tərifdən anlaşılacağı üzərə iqləbdə iki şey edilir. Birincisi, tənvin və ya sakin nunun xalis mimə çevrilməsi. İkinci isə, çevrilmiş olan bu “mim” hərfinin “bə” hərfindən öncə ixfa edilməsidir.

Bu təriflərin işiğında bəzi misallara baxaq: لَيُنْبَذَنَّ - سَمِيعٌ بَصِيرٌ - مِنْ بَعْدِ Bu kəlmələrdə də görüldüyü kimi tənvin və sakin nun hərfindən sonra “bə” hərfi gəlmişdir. “bə” hərfi eynı kəlmədə ola biləcəyi kimi, fərqli kəlmələrdə də ola bilər.

İqləbin səbəbini isə belə açıqlaya bilərik: ب hərfi ilə م hərfinin məxrəcləri eynidir. Bununla birlikdə bu iki hərf, cəhr, istifalə, infitah və izləq sifətləri baxımından müştərəkdirlər. Sakin “nun” “bə” hərfindən öncə gəldiyi zaman, məxrəclərinin uzaq olması səbəbilə idğamları mümkün deyildir. Belə olunca da sakin “nunun” , “bənin” məxrəcindən olan “mim” hərfinə bənzəməsinə ehtiyac hasil olur. Bundan dolayı da sakin “nun” “mim” hərfinə çevrilmişdir. İqləb edilməsi lazım olan yerdə oxuyan kimsənin iqləbi ifa etməsi vacibdir. Bu xüsusda bütün qiraət imamları ittifaq etmişlər. İqləbin tutulma miqdarı isə iki əlifdən az, bir əlifdən isə çoxdur. Yəni bir əlif yarım miqdarı.

## D. TƏNVİN VƏ SAKİN NUNUN İDĞAMI

İdğam mövzusunu qismən də olsa yuxarıdakı bölmələrdə misleyn, mütəqəribeyn və mütəcaniseyn idağamı olaraq incələməyə çalışmışdıq. Burada izah edəcəyimiz mövzu isə sadəcə tənvin və sakin nunun idğamlarıdır. Tənvin və sakin “nun” dan sonra يمنو kəlməsindəki hərflərdən biri gəldiyi zaman idğamlı olaraq oxunurlar. Bu hərflərlə edilən idğam, ğünnəli olub-olmamasına görə məal ğünnə (ğünnəli) və bilə ğünnə (ğünnəsiz) olaraq iki qismə ayrılır.

### 1. İdğami-məal-ğünnə (Ğünnəli idğam)

İdğami-məal-ğünnə ğünnəli idğam deməkdir. Yəni edilən idğamda həqiqətən ğünnə olur. Əvvəlki bölmədə də izah ətdiyimiz kimi ğünnənin məxrəci burundur. Ona görə də ğünnənin olub-olmadığını burnumuza nəzarət edərək anlayırıq. Əgər edilən idğamda burundan səs gəlirsə o ğünnəli idğam

(məal ğünnə), əgər səs gəlmirsə ğünnəsiz idğam (bilə ğünnə) olur.

Tənvin və ya sakin “nundan” sonra يمنو hərflərindən biri gələrsə, belə olduğu zaman ortaya çıxan idğama, idğami-məal ğünnə deyilir. Bu hərflər tək-tək yazıldığında bunlardır و - ن - م - ي

Fəqət idğami-məal ğünnə də öz arasında tam və naqis olmaq üzərə iki qismə ayrılır.

**a. Tam idğami-məal ğünnə**

Tənvin və ya sakin “nun” hərfindən sonra م və ya ن hərflərindən biri gələrsə ğünnəli tam idğam olur. Məsələn: مِنْ نارٍ - من ماءٍ - فَضْلاً مِنَ اللهِ misallarında anlatdığımız vəziyyət vardır.

İzah ettiyimiz tam idğami-məal ğünnədə, müdğam olan birinci hərfdən heç bir əsər qalmadığı üçün, müdğamün fih olan ikinci hərf şəddəli olaraq oxunur. Yuxarıda verdiyimiz misalları bu izaha uyğun olaraq belə hərəkələyib oxuya bilərik: مَنَّارٍ - منَّاءٍ - فَضْلامِّنَ الله kimi.

Bu növ idğamda “nun” hərfinin “nuna” idğamı olduğuna görə müdğam ilə müdğamün fih ayrı kəlmələrdə ya da eyni kəlmədə ola bilər. مِنْ نارٍ kəlməsində ayrı kəlmələrdə, منَّاعٍ kəlməsində isə eyni kəlmədədir.

**b. Naqis idğami-məal ğünnə**

Tənvin və ya sakin “nundan” sonra و və ي hərflərindən biri gələrsə, ğünnəli naqis məal ğünnə olur. Lakin burada onu da qeyd etmək lazımdır ki, bu idğamın ola bilməsi üçün tənvin ya da sakin “nunun”, و və ي hərflərindən ayrı kəlmələrdə olmaları lazımdır. وَمَنْ يَعْمَلْ -مِنْ وَالٍ - مَنْ يَشَاءُ - أَحْيَاءٌ وَلا kimi.

Sakin “nun” “vav” və “yə” ilə eyni kəlmədə olarsa idğam məal ğünnə olmaz , izhar olar. Ərəbcə bilməyənlər buna diqqət etməlidir: nun ilə vav və ya nun ilə yə bir-birinə əlavə olunaraq yan-yana gəlmişsə açıq (izhar) oxunur. صِنْوَانٌ - قِنْوَانٌ - بُنْيَانٌ - دُنْيَا kəlmələrində bu hərflər eyni kəlmə içərisində olduğuna gorə idğami-məal ğünnə deyil, izhar vardır.

Tənvin və ya sakin “nundan” sonra م - və ن hərfləri gəldiyində bütün qiraət imamları burada idğami-məal ğünnə olduğunda həmfikirdirlər. Fəqət tənvin və ya sakin “nundan” sonra ي və و hərfləri gələrsə qiraət imamlarından Xələf xariç digərləri yenə idğami-məal ğünnə oxumuşlar.

İdğami-məal ğünnənin zamanı, iki əlifdən az, bir alifdən çoxdur.

Burada ifadə etməyimiz lazım olan başq bir mühim mövzu da vardır. Bəzi surələrin başında yer alan hürufül-müqəttəələrdən sonra gələn و hərflərinin necə oxunması məsələsi. Bunları tək-tək belə izah etmək olar.

1) يس و القران [23]

Bu ayədə “sin” hərfinin sonunda tənvin vardır və onun ardında bir “vav” hərfi mövcuddur. Burada izharmı yoxsa idğammı edilməlidir? bu xüsusda qiraət alimlərinin fərqli görüşləri vardır. Bunları sıralayaraq bizim qiraət imamımızın oxuyuşunu izah edək.

a. Qiraət imamlarından Hişam, əl-Kisai, Yaqub və Xələf idğam ilə oxumuşdur.

b. Əbu Amr, Qünbül, Həmzə, əbu Cəfər izhar ilə oxumşdur.

c. Nafi, əl-Bəzzi, İbn Zəkvan və Asim xülf[24] ilə oxumuşdurlar.

2) ن و القلم [25]

a. Hişam, əl-Kisai, Yaqub, Xələf idğam ilə oxumuşdırlar.

b. Nafi, Asim və əl-Bəzzi də xülf ilə oxumuşdurlar.

Bu izahlardan sonra deyə bilərik ki, bizim qiraət imamımız Asim, bu keçişlərdə həm idğam, həm də izharlı oxumağa cəvaz (icazə) vermişdirlər.

**2. İdğami-bilə ğünnə**

Ğünnəsiz idğam deməkdir. Tənvin və ya sakin “nun” hərfindən sonra ل ر - hərflərindən biri gələrsə idğami-bilə ğünnə olur. Yəni tənvin ya da sakin “nundan” sonra bu hərflər gələrsə, tənvin və sakin “nun” hərflərə qatılır və bu

---

[23] Yasin , 1-2.

[24] Yəni həm idğamlı həm də izharlı olaraq oxumuşdurlar.

[25] əl-Qələm, 1-2.

hərflərin içində itir. Dolayısıyla da bu hərflər ( ل ر ) şəddəli olaraq oxunurlar. Məsələn:

هُدىً لِلْمُتَّقِينَ - غَفُورٌ رَحِيمٌ - مِنْ رَبِّهِمْ - مِنْ لَدُنْكَ

İdğami- bilə ğünnə ilə səktə üst-üstə düşərsə (eyni yerdə olarsa) səktə oxunur. İdğami-bilə ğünnə tərk edilir. Misal:

وَقِيلَ مَنْ سكته رَاقٍ

Tənvin və sakin "nunun" bu hərflərə idğam olunmasının səbəbi, bir-birlərinə olan məxrəclərinin eyni olmasıdır. Bütün qiraət alimləri idğami-bilə ğünnəni tətbiq etmişdirlər. İmam Asimin Həfs rəvayətinə görə bu, ğünnəsiz idğam olaraq oxunduğu üçün biz də bunu belə oxumalıyıq.

## VII. SƏKTƏ, VƏQF VƏ İBTİDA İLƏ ƏLAQƏLİ MƏSƏLƏLƏR

### A. SƏKTƏ

Səktə, leksik məna etibarilə "susmaq", "iki kəlmə arasını nəfəs almadan ayırmaq" deməkdir. Təcvid elmində isə "Nəfəs almadan səsi kəsmək" mənasına gəlir.[26] İbnül-Cəzəri bu qaydanı belə tərif edir: "Səktə, nəfəs almadan, vəqf işarələrindəki fasilədən daha qısa olaraq nəfəsi bir müddət kəsməkdir." Tərifdən də anlaşılır ki, səktə, "səktə سكته" işarəsi olan yerdə səsimizi nəfəs almamaq şərti ilə, bir vəqf zamanından daha qısa müddət kəsib, ardınca oxumağa davam etməkdir.

Səktənin müddəti**:** Səktənin zamanı, vəqfin zamanından daha qısadır. Bu isə, oxunuşdakı sürətlə paralel olub, təhqiq, tədvir və hədr üsulu oxunyuşlara görə müxtəliflik ərz edir. Ancaq normalda səktənin müddəti 1 əlif miqdarıdır.

Səktənin hökmü: Bəzi kitablarda səktənin hökmünün, vəqfin hökmü kimi olduğu qeyd edilir. Məsələn, tənvinin əlifə çevrilməsi, tə-i mərbütənin hə ه-yə çevrilməsi yaxud da hərəkəli bir hərfin sükunlu hala çevrilməsi kimi. Qiraət

[26] Səktə, nəfəsi deyil, səsi kəsməkdir. Vəqf, nəfəslə birlikdə səsi kəsməkdir.

alimlərinin əksəriyyətinə görə, doğru olan görüş budur. Asim Qiraətinin Həfs Rəvayətinə görə Qurani-Kərimdə 4 yerdə səktə vardır. Bunlardan ikisi vəqfdə, digər ikisi isə vəsldədir.

1- عِوَجاً قَيِّماً [27]: Burada səktə, vəsl halında عِوَجاً ilə قَيِّماً kəlmələri arasında meydana gəlir.

Oxunuş qaydası: Birinci kəlmənin sonunda təbii-mədd tətbiq edilərək səs kəsilir və bu arada nəfəs almadan qısa müddət gözləyərək digər kəlməyə keçilir.

Buradakı səktənin səbəbi, عِوَجاً kəlməsindən sonra gələn قَيِّماً kəlməsinin, ayənin başında keçən "kitab" kəlməsindən "hal" olduğunu göstərmək üçündür. Bu səbəblə, əgər səktə edilməzsə, قَيِّماً kəlməsi, عِوَجاً kəlməsinə bitişik və onun sifətiyimiş kimi anlaşılar ki, bu doğru olmaz. Çünki, bu iki ləfz arasında sifət-məvsuf (isim-sifət) əlaqəsi yoxdur. Buna görə ilk kəlmədə səktə etmək, iki ayənin mənasının düzgün anlaşılmasına imkan verir. Bu iki kəlmə arasında səktə edilsə də, ayə sonu olmasıyla yanaşı vəqfin[28], səktədən daha güclü bir ayırıcı xüsusiyyətinə malik olduğu üçün عِوَجاً kəlməsində durmaq, səktə etməkdən daha yaxşıdır. Ayrıca, burada olduğu kimi bütün səktələr vəqf hökmündədir. Yəni birinci kəlmədə vəqf edildikdə, kəlmənin tənvini əlifə çevrilir. Vəsl halındakı səktə də eyni qaydadadır. O halda Asim Qiraətinin Həfs rəvayətinə görə kəlmədəki ج hərfinin tənvini nə vəsl, nə də vəqf halında oxunur.

2- مَرْقَدِنَا هذا [29]: Burada səktə, vəsl halında مَرْقَدِنَا ilə هذا kəlmələri arasında meydana gəlir.

Oxunuş qaydaşı: Birinci qaydada olduğu kimi, مَرْقَدِنَا ləfzi üzərində səs kəsilir və bu arada nəfəs almadan qısa müddət gözləyərək digər ləfzə keçilir.

---

[27] Kəhf, 18/1-2. Burada "ivəcən" kəlməsi Kəhf surəsinin birinci ayəsinin bitişi, "qəyyimən" isə ikinci ayəsinin başlanğıcıdır.

[28] Səktə ancaq vəsl halında meydana çıxır. Vəqf halı, hərəkəni və ya tənvini düşürdüyü kimi səktəni də düşürür.

[29] Yasin, 36/52. "Onlar deyəcəklər: Vay halımıza! Bizi yatdığımız yerdən (qəbir evindən) kim qaldırdı? (Onlara belə deyiləcək: ) "Bu, Rəhmanın məxluqata buyurduğu və'ddir (qiyamət günüdür). Peyğəmbərlər doğru deyirlərmiş!"

Burada səktə edilməsinin səbəbi, iki kəlmə arasında sifət-məvsuf əlaqəsinin olmadığını göstərmək üçündür. Yəni, səktədən əvvəl keçən ifadələr kafirlərin, səktədən sonra keçən ifdələr isə möminlərin və yaxud mələklərindir. Beləliklə səktə etmək surətiylə, möminlərlə kafirlərin sözləri birbirinə qarışmamış olur.

Burada səktə caiz olsa belə, مَرْقَدِنَا kəlməsindən sonra vəqf etmək daha yaxşıdır.

3- وَ قِيلَ مَنْ رَاقٍ [30]: Bu ayədə səktə, مَنْ ilə رَاقٍ kəlmələri arasında fəqət مَنْ ləfzi üzərində meydana gəlir.

Oxunuş qaydası: مَنْ kəlməsinin sonundakı ن hərfi üzərində səs kəsilir və bu arada nəfəs almadan qısa müddət dayanaraq digər kəlməyə keçilir.

Bu səktənin səbəbi, مَنْ ilə رَاقٍ kəlmələrinin tək kəlmə olmayıb, ayrı-ayrı iki kəlmə olduqlarını bildirmək üçündür. Əgər burada səktə edilməsə, sakin نْ-dan sonra ر hərfi gəldiyi üçün idğami-bilağunnə olması lazım gələrdi və bu halda da ayənin mənasıyla əlaqəsi olmayan مَرَّاق tələffüzü[31] ortaya çıxardı. Halbuki, burada səktə edilmək surətilə idğami-bilə ğünnəyə mane olunur, beləliklə məna düzgünlüyü üçün iki kəlmənin ayrı-ayrı müstəqil olaraq oxunması təmin olunur.

Burada vəqf etmək olar, ancaq səktə etmək daha yaxşıdır.

4- كَلاَّ بَلْ رَانَ [32]: Səktə, burada بَلْ ilə رَانَ kəlmələri arasında fəqət بَلْ kəlməsi üzərində tətbiq edilir.

Oxunuş qaydası: Birinci kəlmədəki cəzmli لْ hərfi üzərində səs kəsilir və bu arada nəfəs almadan qısa müddət gözlənilərək ikinci kəlməyə keçilir.

Bu səktənin ediliş səbəbi, daha əvvəl də bəhs etdiyimiz kimi بَلْ ilə رَانَ kəlmələrinin ayrı-ayrı iki kəlmə olduğunu bəyan etmək üçündür. Əgər burada səktə edilməsə, təcvid qaydası olaraq idğami-mütəqəribeyn meydana gəlmiş olar ki, nəticədə بَرَّان oxunar. Halbuki ərəbcə "bərranə" kəlməsi "dibçəkçi"

---

[30] Qiyamə, 75/27. "(Onu bu bəladan) kim xilas edə bilər?" - deyiləcək.

[31] مَرَّاقٌ Mərraq, şorbası deməkdir.

[32] Mutəffifin, 83/14. Mənası: "Xeyr, belə deyil. Əksinə, onların qəlblərini qazandıqları (günahlar) qaplamışdır."

mənasına gəlir. Belə olduqda isə, iki kəlmənin arasında məna uyğunsuzluğu ortaya çıxır. Ona görə də, burada səktə edilməklə idğama mane olunur və aradakı qarışıqlıq ortadan qalxaraq ayənin mənasının düzgün anlaşılması təmin olunmuş olur.

Burada vəqf caiz olsa belə, səktə edilməsi daha yaxşıdır.

Bundan başqa, Təcvid elmində Səktə "hə"si, yəni هاء السكت adında bir qayda da vardır ki, Qiraət imamları Quranda yeddi kəlmənin vəqf halında səktəli oxunacağı barəsində ittifaq etmişdirlər. Bu kəlmələrin vəsl hallarında isə səktəli oxuyub oxumamaqda ixtilaf etmişdirlər.

Bu kəlmələr لَمْ يَتَسَنَّهْ (Bəqərə, 2/259), اقْتَدِهْ (Ənam, 6/90), كِتَابِيَهْ , حِسَابِيَهْ , سُلْطَانِيَهْ , مَالِيَهْ , (Haqqə, 69/19, 25, 20, 26, 28, 29), مَاهِيَهْ (Qariə, 101/10)

Bu kəlmələri vəqf halında bütün imamlar "hə-i səkt" ilə oxumuşlar. Asim Qiraətinə görə isə, bu kəlmələr həm vəqf, həm də vəsl halında "hə-i səkt" ilə oxunur.

## B. VƏQF VƏ İBTİDA

Vəqf الوقف lüğətdə, durmaq ya da durdurmaq mənalarına gəlir. Təcvid elmində isə "nəfəslə bərabər səsi kəsməkdir" şəklində ifadə edilir. İbnül-Cəzəri isə "vəqfı" belə tərif etmişdir: Vəqf, kəlmə üzərində qiraətə təkrar başlamaq niyyəti ilə, adət olduğu şəkildə nəfəs alacaq qədər bir zaman müddətində səsi kəsməkdən ibarətdir. Vəqf sadəcə kəlmənin sonunda edilir. Kəlmənin ortasında vəqf olmaz.

İbtida الإبتداء lüğətdə başlamaq deməkdir. Buradakı ibtidadan məqsəd, ya vəqf etdikdən sonra qiraətə davam etmək üçün təkrar başlamaq və ya qiraətə yeni başlamaqdır.

### 1. Vəqf və İbtidanın əhəmiyyəti

Təcvid elmi, Quranın daha rahat oxunup daha doğru anlaşılmasına xidmət edən bir elmdir. Bu xidməti edərkən iki mühim işi yerinə yetirir.

a) Hərflərin məxrəclərinə və sifətlərinə diqqət edərək oxumağı təmin edir. Bu şəkildə kəlmələr daha səhhətli və düzgün oxunur.

b) Vəqf və ibtida məhəllərini təsbit edərək yanlış anlaşılmaların önünü alır.

Vəqf və ibtida bir başa Quranın mənasıyla əlaqəli bir məsələdir. Vəqf və ibtidaya riayət etmək şəxsən Həzrət Peyğəmbər əfəndimizin (s.ə.s) feli sünnəsilə sabitdir.

**2. Hərəkəli və sükunlu kəlmə üzərində vəqf**

Vəqfdə əsasın sükun olduğunu söyləmişdik. Sükun, bir kəlmənin sonunu, əgər hərəkəli isə sakin etməyə deyilir. Ərəbcədə sükün ilə başlanılmadığı kimi, hərəkə üzərinə də vəqf edilməz. Hərəkəli və sükunlu kəlmələr üzərinə vəqfi maddələr halında belə izah etmək olar:

a) Sonu sükunlu kəlmə üzərinə vəqf: Vəqf edilən kəlmənin sonu sükullu isə, olduğu kimi tərk edilir. Məsələn: رَبِّي، صَلُّوا، عَصَوْا، قُلْ kimi.

b) Kəlmənin sonu üstünlü (məftüh)olduğu zaman: Belə olduqda kəlmə sakin edilir. Məsələn: إِذَا حَسَدَ-إذا حَسَدْ، الْعَالَمِينَ-الْعَالَمِينْ

c) Sonu əsrəli (məksür) olan kəlmədə vəqf: Kəlmənin sonu əsrəli isə, iki növ vəqf caizdir:

c1) Sükun üzərə vəqf. Misallar yuxarıdakı kimidir.

c2) Rəvm ilə vəqf: Məsələn: مِنَ النَّاسِ ، الرَّحِيمِ kimi.

ç) Sonu ötrəli (məzmum)olan kəlmələrdə vəqf: Burada üç növ vəqf caizdir:

ç1) Sükun üzərə vəqf.

ç2) Rəvm ilə vəqf

ç3) İşmam ilə vəqf. Məsələn: الْحَمْدُ، مِنْ قَبْلُ kimi.

d) Vəqf edilən kəlmənin sonu şəddəli isə, təşdidə riayət etmək surətilə o hərfin şəddəli olduğu tələffüzdə bildirilməlidir.

Məsələn: فِي الْيَمّ، مُسْتَقَرٌّ، تَبَّ kimi.

e) Əgər vəqf edilən kəlmənin sonunda hərəkəli vav ( و) və ya yə (ي ) hərfi olub, özlərindən əvvəlki hərfin hərəkəsi də öz cinslərindən olarsa vəqfdə

ki sükunluq səbəbilə məd hərfi olurlar. Məsələn: هِيَ=هِي ،هُوَ=هُو kimi.

ə) Kəlmənin sonu tənvinli isə, vəqf səbəbilə tənvin düşər və tənvinli hərf sakin oxunar. Çünki tənvin kəlmənin son hərfinin hərəkəsinə daxil olan sakin zaid (artıq) bir nundur və hərəkənin düşməsi ilə tənvin də təbiəti etibarilə düşər. Məsələn: مِنْ نَخِيلٍ=مِنْ نَخِيلْ ،حَمِيمٌ=حَمِيمْ kimi.

Əgər tənvin iki üstün isə, o zaman tənvinin əvəzinə əlif üzərinə vəqf edilir. Məsələn: بَصِيرًا=بَصِيرَا kimi.

Tənvin təi-mərbütə (yuvarlaq tə) də olarsa, vəqf halında yenə düşər və hə (ه) hərfi üzərinə vəqf edilər. Məsələn: رَحْمَةً=رَحْمَهْ kimi.

f) Əgər kəlmənin sonunda tə ( ت) hərfi varsa o zaman əgər bu tə ( ت) təi-tavilə dediyimiz uzun tə isə, tinin sükunu ilə oxunur.

Məsələn:، هَيْهَاتَ=هَيْهَاتْ ،فِي السَّمَوَاتِ=فِي السَّمواتْ ،يُمِيتُ=يُميتْ

kimi. Ancaq bu tə (ت) təi-mərbütə dediyimiz yuvarlaq tə ( ة) isə, hə (ه) üzərinə vəqf edilir. Misallar ə). bəndinin üçüncü paraqrafındakı misallarla eynidir.

g) Müfrəd, müzəkkər, ğaib zəmirləri vəqf halında sakin olurlar. Məsələn: رَبَّهْ، فِيهْ ، رَأَيْتُمُوهْ، kimi. İsmi-işarə olan هَذِهِ kəlməsi də eyni qaydaya tabedir.

ğ) Qurani-Kərimin iki yerində təkid nunu tənvin ilə yazılmışdır.Bunlardan birincisi ( وَلَيَكُونًا)[33] ikincisi (لَنَسْفَعًا)[34] kəlmələri olub, bu kəlmələrdə də əlif üzərə vəqf edilir.

Həfs rəvayərində heç bir şeyə bədəl edilmədən yeddi yerdə əlif üzərə vəqf edilir.

Birincisi: Mütəkəllim vəhdə zəmiri olan (أَنَا) kəlməsidir. Bu kəlmədə vəqf edildiyi zaman bütün qiraət alimləri əlif üzərə vəqf etməkdə ittifaq etmişdir.

[33] Yusuf- 12/32

[34] əl-Ələq – 96/15

İkincisi: ( لَكِنَّا)[35] kəlməsidir. Bu kəlmənin də əlif üzərə vəqf edilməsində ittifaq vardır.

Üçüncüsü: (الظُّنُونَ)[36]

Dördüncüsü: (الرَّسُولاً)[37]

Beşincisi: (السَّبِيلا)[38]

Altıncısı: (سَلاسِلاَ)[39] Həfs bunu vəsl halında tənvinsiz, vəqf halında isə bir rəvayətində əliflə, digər rəvayətində isə əlifsiz vəqf edir.

Yedincisi: (قَوَارِيرَا)[40] Həfs vəsl halında bunu tənvinsiz, vəqf halında əliflə vəqf edir. Keçən yeddi kəlmənin hamısı bütün Mushaflarda əliflə yazılmışdır. Amma əl- İnsan surəsində keçən ikinci ( قَوَارِير)[41] kəlməsi, bəzi Mushaflarda əliflə, bəzilərində əlifsiz yazılmışdır.Həfs bu ikincini vəsl halında tənvinsiz, vəqf halında ra (ر) nın sükunu ilə və əlifsiz oxumuşdur.

**3. Vəqf etməkdə əsas olan hallar**

Vəqfin edilməsi xüsusunda bu əsaslardan hərəkət edilmişdir:

a) Bir qisim alimlərə görə vəqfdə əsas, kəlamın tam olub-olmamasına baxmadan ayələrin başında dayanmaqdır.Çünki ayələrin başında vəqf etmək sünnədir. Ayənin mənası özündən sonra gələn ayədə davam etsə də vəziyyət yenə də eynidir. Əbu Amrın tərcih etdiyi bu xüsus sünnəyə tabe olmaq üçün ən fəzilətli vəqfdir.

b) Bəzi alimlər vəqf və ibtidada əsasın məna olduğunu, məna etibarilə vəqf və ibtidaya tabe olmanın daha da gözəl olavağını söyləmişlər. İman Nafi bu yolu tərcih etmişdir.

---

35 əl-Kəhf- 18/36
36 əl-Əhzəb- 33/10
37 əl-Əhzəb- 33/66
38 əl-Əhzəb- 33/67
39 əl-İnsan-76/4
40 əl-İnsan- 76/15
41 əl-İnsan- 76/16

c) Bir qrup alimə görə isə, vəqfdə əsas, nəfəsin kəsilməsidir. İbni-Ksir və Həmzənin görüşü budur.Bunlar nəfəsləri kəsildiyi üçün vəqf edərlər.

d) İmam Asim və Kisainin də daxil olduğu bir qrup alimlərə görə vəqfdə əsas, kəlamın tamam olmasıdır. Vəqf üçün kəlamın, ləfz və məna cəhətiylə tamam olduğu yerdə vəqf edilir.İmam Asimin gözəl ibtida etdiyini də burada qeyd etmək lazımdır.

**4. Vəqf işarələri və səcavəndlər**

Vəqf işarələri, Quran ayələrinin sonuna və ya ayənin ortasındakı kəlmələrin üstünə qoyulan "dayanacaq işarələri"dir. Bu işarələrin hər birinin ifadə etdiyi məna vardır. Vəqf işarələrinə Təcvid elmində "səcavənd" də deyilir. Hicri VI əsrdə Məhəmməd b. Teyfur əs-Səcavəndi (v. 560/1165) tərəfindən, məna nəzərdə tutularaq Qurana qoyulan bu işarələr aşağıdakılardır.

a) Mim (م) Vəqfi-Lazım: Yəni lazım vəqfdir və mütləq dayanmaq lazımdır. Dayanmayıb keçilərsə məna pozula bilər. Vəqfi-lazım əlamətləri 84 yerdədir. Bunlarda vəqf etmək vacib, vəsl etmək isə haramdır.

b) Ta (ط) Vəqfi-Mütləq: Yəni mütləq vəqfdir və keçilməsi caiz olsa da, dayanılması daha uyğundur. Çünki bu işarə, məna baxımından bir-birindən ayrı kəlmələrin üzərinə qoyulur.

c) Cim (ج) Vəqfi-caiz: Yəni caiz vəqfdir. Dayanıla da bilər, dayanılmaya da bilər. Ancaq dayanmaq daha uyğundur.

ç) Zə (ز) Vəqfi-Mücəvvəz: Vəqf etmək caiz olsa da, keçmək daha yaxşıdır.

d) Sad (ص) Vəqfi-Mürəxxəs: Yəni rüxsət verilən vəqfdir. Ayənin uzun olması və bu səbəblə nəfəsin çatmaması ehtimalına qarşı vəqf etməyə icazə verilmişdir. Vəqf edilincə, geridən alınıb oxunmasına ehtiyac yoxdur.

e) Lə (لا) Vəqfi-Lə: Bu işarə, məna baxımından bir-biri ilə əlaqəli kəlmələr arasına qoyulur. Ona görə də, dayanmaq olmaz. Əgər nəfəs çatışmamazlığı səbəbilə dayanılsa, ayə geridən alınaraq oxunmalıdır. Bu dayanacaq ayə sonlarında gələrsə, bu halda keçilə də bilər, dayanıla da bilər.

ə) Qif (قف): Dayandıqda, ayənin mənası daha yaxşı anlaşılacağı üçün dayanmaq daha uyğundur.

f) Qaf (ق): Dayanıla da bilər, keçilə də bilər. Ancaq keçmək daha uyğundur.

g) Ayn (ع): Ayələrin sonlarında olur. Bir mövzunun qurtardığını, digər mövzunun başladığını göstərir. Namazda oxuyarkən, ayn (ع) işarəsinin olduğu yerdə dayanıb, rükuya getmək daha uyğundur.

ğ) Kəf (ك): Özündən əvvəlki vəqf işarəsi nə ifadə edirsə, bu da onu ifadə edir.

h) Müaniqə vəqfi ( ∴ ) Ayələrdə bir-birinə yaxın yerlərdə iki ayrı yerə qoyulan "üç nöqtə"dir. Birinci üç nöqtədə dayanıldıqda, ikincisində dayanılmaz. İkinci üç nöqtədə dayanıldıqda, birincisində dayanılmaz.

## C. QURANDA BƏZİ KƏLMƏLƏRİN ALTINDAKI İŞARƏLƏRİN MƏNASI

Məd (مد): Bəzi kəlmələrdəki hərfin altında olan bu işarə, o hərfin bir əlif miqdarı uzandığını göstərir. Dil qaydası olaraq qabağında məd hərfi (و , ا və ya ي) qoyulmayan, ancaq uzadılması lazım gələn yerlərdə qoyulur. Məsələn:

تَشَاؤُنَ، يُرَاؤُمدنَ، دَاوُمددُ
مد مد مد

Qəsr (قصر): Uzadılmaz, yəni qısa oxumaq lazım gəldiyini bildirir. Dil qaydasına görə, uzadma hərfi olduğu halda, uzadılmaması lazım gələn yerlərdə qoyulur. Məsələn:

اُولٰٓئِكَ، وَمَآ اَنَا
قصر قصر

Sin (س): Sad (ص) hərfinin altına yazılır və həmin hərfin sin (س) kimi incə oxunduğunu ifadə edir. Məsələn: يَبْصُطُ، بَصْطَةً

Nun (ن): Son hərəkəsi tənvinli olan kəlmənin axırıncı hərfinin altında qoyulur. Belə ki, həmin kəlmədən digər kəlməyə keçərkən "əsrəli nun" ilə keçiləcəyini bildirir. Məsələn: لُمَزَةٍ الَّذِي

Qəti (قطع): Mütləq oxunan həmzələrin altında olur və o həmzənin hərəkəsilə birlikdə oxunduğunu ifadə edir.

Səktə (سكته): Səktə edilməsi lazım olan yerlərdə yazılır.

İşmam (اشمام): Yusif surəsi 11ci ayədəki (لَا تَأْمَنَّا اشمام) şəddənin altında yazılıb. Kəlmənin açılışına nəzər yetirdikdə, əslində iki nun var və biricisi ötrəlidir (əsli لَا تَأْمَنُنَا -dir). Elə buradakı ötrə hərəkəsini bildirmək üçün birinci nunda ötrə səsi çıxarılmır, sadəcə dodaqlar qabağa tərəf uzadılır. Ardınca da, eynilə dodaqlar öndə olaraq ğünnə edilir. "Nəə" (نَا) demədən qabaq da, dodaqlar geri çəkilir.

Təshil (تسهيل): Füssilət surəsinin 44-cü ayəsindəki (ءَأَعْجَمِيٌّ) kəlməsində ikinci həmzənin altında olur. "Həmzə" ilə "əlif", yaxud "həmzə" ilə "hə" arasında bir səslə oxunur. Yəni, yumuşaldılır.

İmalə (اماله): Hüd surəsinin 41-ci ayəsindəki (مَجْرٰيهَا) kəlməsinin altında olur. Bu kəlmədəki "ra" hərfinin imalə ilə, yəni üstün ilə əsrə arası bir səslə oxunduğunu ifadə edir.

## ÜÇÜNCÜ BÖLMƏ

### I. QURAN ÖYRƏTMƏDƏ VƏ ƏZBƏRLƏMƏDƏ BƏZİ MƏSƏLƏLƏR

#### A. ƏLİFBANI ÖYRƏTMƏ METODU

Hər şeydən əvvəlcə bir şeyi  bilmək lazımdır ki, hər dilin əlifbasındakı hərflər o dilin əslidir, təməlidir. Dolayısı ilə bu hərflər nə qədər doğru, yəni o dilin əslinə nə dərəcədə uyğun bir şəkildə öyrənilərsə öyrənən kimsə o nisbətdə dili doğru tələffüz etməyə müvəffəq olar.

Bu izahdan sonra bir şeyi də qeyd etmək lazımdır: Qurani-Kərim ərəbcədir, amma, Allah kəlamının ifadəsi olan Quran ərəbcəsi, danışılanlan ərəbcəyə nəzərən fərqli xüsusiyyətlər ərz edir. Bu xüsuslar Təcvid adlı elmi qaydalardır. Eyni zamanda ibadət ifadələri olan bu qaydalar vəhyi-mətlüvdürlər (Quran) və bu şəkildə oxumanın fərz olması hökmü yalnızca Qurana məxsusdur. Bu əhəmmiyətə əsasən Qurani-Kərimin əlifbası, lazımilə öyrənilməlidir.

Bunun təmin edilməsi üçün əlifba dediyimiz Quran əlifbası qətiyyətlə Türkcə,Azərbaycanca və ya başqa hərflərlə öyrədilməməlidir. Məsələn: (ح هـ)

bu üç hərf olduqları kəlmədə ayrı mənalar ifadə edərlər. Halbuki Azərbaycan dilində onların yerinə yalnız (H) hərfi işlədilir. Kəlməni necə yazsaqda əslindəki tələffüz fərqliliklərini tam olaraq Azərbaycanca hərflərlə əks etdirə bilməyimiz əsla mümkün deyildir. Qaldı ki, hərflər bu metodla bir kərə yanlış öyrənildikdən sonra yenidən düzəldiləbilməsi üçün müəllimin böyük bir qeyrət göstərməsi lazımdır. Halbuki əvvəlcədən qeyrət göstərməklə bu hərflərin əsl dilə uyğun öyrənilməsi daha da az vaxt aparır.

Qurani-Kərimi öyrənmək istəyənə hərflər məxrəclərindən, sıfətlərinə kimi tək-tək müəllim tərəfindən ifadə edilərək tələffüz etdirilməlidir. Hərflərin məxrəc və sifət xüsusiyyətləri qorunaraq əzbərlədilməlidir. Əzbər işi bu ciddiyyət çərçivəsində 50%-ə çatdığında nöqtəli hərflər üzərində çalışma etdirilməlidir:

Əlifbada və Qurani-Kərimdə altında bir nöqtəsi olan hərflər ikidir: (ب ج) .(ج) hərfinin yanına bu (جـ) şəkil qoyulmalı və nöqtəsi altdadır deyərək göstərilməlidir. Bu iki hərfin bir-birindən fərqini göstərmək üçün də (ج) in çəngəl şəklində olduğunu söyləmək gözəl olar. Hərflərin əlifbadakı yazılış şəklinə Qurandakı yazılış şəklinin əlavə edilməsi tələbənin Qurana başladığında çaşmaması üçün son dərəcə faydalıdır.

Yenə əlifbada və Qurani-Kərimdə altında iki nöqtəsi olan tək bir hərfin olduğu və altında üç nöqtə olan hərfin olmadığı söylənildikdən sonra üstə keçilir. (altında iki nöqtəsi olan tək hərf: (ى)

Üstdə bir nöqtəsı olan hərflər təsbit edilir. Bunların şəkilləri də bir-birinə bənzəmədiyinə görə əlifba əzbərləndiyi zaman bu hərflərə öyrəşmək də asan olur. Üstdə iki nöqtəya keçilir. Bunlar (ت) ilə (ق) dır. Aralarındakı fərq (ق) ın başı vardır, demək surətilə göstərilir. Üç nöqtəliyə keçilir. (ث) ilə (ش) in fərqləri (ش) in üç dişinin olması, (ث) nin isə ya bir dişinin olması və ya heç olmamasıdır. Söylənilən bütün misallar yaxşıca başa salınır. Bu hərfləri belə öyrətməkdəkı fayda budur: Hərflərin bitişik yazıldığı kəlmələrdə öyrənən kimsəni ən çox çaşdıran bu yeddi hərfdir (ب ت ث ج ش ق ى). Əlifbanın bu şəkildə əzbərlədilməsi çaşmamaq üçün daha əlverişli bir yoldur və bu təcrübə ilə sabitdir. Hərflər tam tanıdılıp əzbərlədildikdən sonra sıra harəkələrin hərflər üzərində tətbiqatına gəlir. Bu mərhələdə tövsiyə edilən yön belədir: Aşağıda göstərdiyimiz kimi uzunca bir çizgi cızılır. Bu xəttin üstünə üstün

qoyulduğunda adı da yazılır. Bu üstünün altına (Ə) yazılaraq “üstün, hərfə Ə səsi verdirir” deyərək məlumat verilir. Digər hərəkələrdə də eyni metod tətbiq edilir.

Ötrə (U) ُ ___ َ Üstün (Ə)
ِ Əsrə (İ)

Bunlar tələbəyə həzm etdirildikdən sonra heca tatbiqatına keçilir və (ب) dən başlanır. (ب) yazılır, biraz uzağına da (B) yazılır. Bu (B) nin önünə (Ə) hərfi qoyularaq taləbəyə oxudulur, Sonra (ب) nin üstünə üstün qoyularaq o da oxudulur. BƏ = (بَ) olur. Əsrə və ötrənin tatbiqatları da eyni şəkildə (ب) və (ت) hərflərinə tətbiq edilir. Fəqət (ت) dən sonra Azərbaycancadan istifadə edilmir. Bu hərəkə tatbibatı ərəbcə hərflər üzərində həzm etdirilincəyə qədər davam etdirilir. Kəlmə misalları ilə hərəkə tatbiqatı da hərəkəli hərflərin tək başına və kəlmə olaraq oxunması ilə bitər. Bu bəhs edilən çalışma daima yazı taxtasından istifadə edilərək edilməlidir.

Hərəkənin tətbiq işini bitirdiktən sonra əlifbanın normal səhifələrinə keçilir. Əgər tələbə hərfləri tam qavramadan, hərəkə tətbiqatına alışmadan normal səhifə oxuyuşuna keçirilərsə həm ona büyük bir çətinlik yüklənmiş olar, həm də öyrədən çox yorular.

Hərflər və hərəkələr öyrədilərkən düz üstünlü hərflərin uzadılaraq tələffüz edilməsindən şiddətlə uzaq durmaq lazımdır. Uzadılmayan hərflərin oxunması üçün lazım olan zaman “toyuğun bir buğdanı yerdən aldığı qədər zamandır” deyilərsə çox qısa bir zamanda öyrəşilmiş olar.

## B. QURANİ-KƏRİM XƏTM EDİLƏRKƏN SON SURƏLƏRDƏ İZLƏNİLƏN YOL

Zuhadan etibarən olan surələrə qısa surələr deyirik. Əvvəcə bu məsələyə açıqlıq gətirək.

Hücüratdan Burucun sonuna qədər olan surələrə “Tivəli-müfəssəl”, Tariqdən Beyyinənin sonuna qədər olanlara “Əvsəti-müfəssəl”, Zilzəldən sonrakılara da “Qisəri-müfəssəl” deyilir.

Xətm üsulü tətbiqatı Zuhanın sonundan başlayır. Bütün qiraət imamları

bu surələrin sonunda təkbir alırlar: (اَللهُ أَكْبَرُ) Son zamanlarda bəzi Quran oxuyucuları bu təkbiri qurban kəsmədə olduğu kimi ikiləşdirirlər. Bunun məsnədi yoxdur. Xətm tətbiqatlarında təkbir bir kərədir. Cümhuru-qürranın sünnəsi belədir. Təhlil (لاَ إِلَهَ إلاَّ الله والله أَكْبَرُ) İbn Kəsirin vəchidir, təhmid isə (الله أَكْبَرُ وَلِلهِ الْحَمْدُ) bu imamın birinci ravisi Bəzzi (هـ) nin rəvayətidir. İxlasdan aşağı surələrdə Təhlil və təhmid ola bilsin ki, Sələfin tatbiqatına görə təbərrükən edilir.

Bu nöqtədə bir xüsusun daha qeyd edilməsi lazımdır. Qurani-Kərim başdan sona xətm edilincə İxlası mükərrər (təkrar) oxumaq caiz deyildir. Çünki sıra ilə oxumaqda təkrar yoxdur. Xətm xaricində savab məqsədilə (Yasin və Mülk surələri kimi) bəzi surələr oxunduğu zaman İxlasla bitirmək məqsədyönlü görülə bilər. O zaman İxlası üç kərə təkrar etməkdə bir xətm savabı olduğundan təkrarda bir qüsur yoxdur. Ancaq sonlarında alınan təkbirlər bir dəfə olmalıdır.

## C. QURAN OXUYARKƏN TƏTBİQ EDİLƏCƏK DODAQ TƏLİMİ

Dodaq təlimi deyilincə ağla (و م ب) hərfləri ilə ötrə, işmam və idğam gəlir. Dodaq təlimi Quran oxuma üsulundə müstəsna bir yer işğal edir. Əvvəlcə sadəcə dodaq təlimi oxudan müəllimlər var imiş. İndi isə Qurani-Kərimi normal oxuma qadalarına görə oxudanlar belə nadir tapılır. Bunu qətiyyətlə ifadə edək ki, dodaq təlimi Quran oxumanın tamamlayıcı mühim bir qaydası olduğundan tərk edilməsi mümkün deyildir.

Dodaq təliminin nə olduğuna gəldiyimizdə, (ب) cəhr hərfidir; eyni zamanda şiddət sifəti də olduğundan dodaqlar qüvvətlicə bir-birinə qapanaraq oxunur. (م) isə cəhr hərfi olmaqla birlikdə şiddət sifəti olmadığından məxrəcinə orta qüvvətdə dayanır, dolayısıyla dodaqlar xəfif qapanaraq ifadə edilir. (و) isə nə alt dodağı dişlərə vuraraq nə də dodaqları heç bir-birinə dəydirmədən yalnız ağız səsi ilə oxudulur. (و) sərçə (ən kiçik) barmağımızın ucunu tam ön dişlərimizə vurduğumuzda dodaqlarımızın qalan qismini bir-birinə xəfifcə dəydirərək ifadə edilir. Çünki "rixvə" hərfidir; yəni yumuşaq hərfdir. Ötrənin tələffüzü əsnasında isə dodaqlar heç bir təzyiq olmadan rahatlıqla tam irəli getməlidir.

İdğamlarda hüküm müdğamün fîhdədir. Əgər müdğamün fih üstün və ya əsrə isə ötrənin tələffüzündən sonra dodaqlar dərhal geriyə çəkilir. Misal: (اَللّٰهُمَّ) dəki idğamda müdğamün fîh olan ikinci mim üstün olduğundan dodaqlar (هـ) hərfinin ötrəsi söyləndikdən sonra dərhal geri çəkilir və mimin tutulması da dodaqlar geridə ikən edilir. Bunun ziddi (جَدُّكَ) kəlməsidir. Burada dodaqlar cimi dal hərfinə çarpar-çarpmaz dərhal irəli gedərlər. İqləb və dodaq ixfasında təlim tətbiqatı eynilə burada olduğu kimidir. Məsələn: (قَوْمًا بُورًا) dakı tutma dodaqlar geridə ikən edilir. Tutma müddəti tamamlandıqdan sonra dodaqlar irəli verilərək ardından (ب) nin ötrəsi tələffüz edilir. (لَيُنْبَذَنَّ) tam bunun ziddidir. Yəni dodaqlar irəlidə ikən tutma edilir, geri çəkilincə ardından (ب) tələffüz edilir. (هُمْ بِهَ) dəki hərəkət də eynilə (لَيُنْبَذَنَّ) də olduğu kimidir. Bu hallara bu qədər diqqət göstərilməsinin səbəbi iqləb ilə ixfai-şəfəvinin, idğamla qarışdırılmasını əngəlləməkdir.

(وَلَهُنَّ - أَعْمَالَهُمْ - وَلَكُمْ) kəlmələri və bunlara bənzəyən kəlmələrdə vəqf edildiyində dodaqlar ötrə (işmam) halında ikən səs bitirilməlidir. Əks təqdirdə yanlış olur.

Ayəti-cəlilələrin sonlarında da əgər son hərfin əvvəli ötrə isə eyni qayda tətbiq edilir, çünki "sakin əvvəlinə tabedir".

## Ç. HİFZƏ ÇALIŞDIRMA METODU

Bu çalışma hifz öncəsi -əzbərə hazırlanma dövrü- və hifz zamanı olmaqla iki mərhələdə ələ alınmalıdır.

### 1. Hifz öncəsi çalışma

Qurani-Kərimi ilk öyrətməyə başladığımızda hərflərin məxrəc və sifətlərinə riayət edərək əlifba üsuluna uyğun şəkildə öyrədilir.

Qurani-Kərimə keçildiyində Fatihə və (الم) normal olaraq oxudulur.

(إن الذين كفروا) səhifəsinə keçilir. Birinci ayə oxudularkən (إِنَّ) dəki tutma, (الَّذِينَ) dəki (ذ) hərfinin yerindən oxudulması və məddinin bir əlif olması, (كَفَرُوا) dakı (ر) qalın, (سَوَآء) dəki məd ölçüsü, (عَلَيْهِمْ أ) dəki izhar,

(ءَ أَنْذَرْتَهُمْ) dəki ixfa (ر) qalın, (أَمْ لَمْ تُ) dəki izharlar, (تُنْذِرْهُمْ) dəki ixfa (ر) incə, (لاَ يُؤْمِ) dakı (نُونَ) , (ء) daki vəqf, qisaca bunların hamısına lazım gələn diqqət və əhəmiyyət göstərilməlidir.

Qurani-Kərimi yeni oxumağa başlayan bir insanın "görəsən bu Quran necə oxunur?" sualına ən uyğun cavab bu ayədə tərif etdiyimiz şəkildə bir oxunuşun edilməsi olacaqdır. İlk dəfə eşitdiyi bu tətbiqat psixoloji olaraq ona təsir edəcək, beləcə bir ayə üzərindəki bu ilk tatbiqat bütün Quran oxunuşunda öz əksini tapacaqdır. Bu ayə, bu qaydalar həzm edilincəyə qədər oxudulur. Bundan sonrakı ayələrin oxunmasına mümkün olduğu qədər doğru və sürətli bir şəkildə davam edilir. İki cüz qədər irəlilədikdən sonra hərflərin sifətləri əzbərlədilir. Oxuma işi irəlilədikcə hərf və kəlmə təkrarına yol verilmədən oxunuş səliqəsi təmin edilir. Sıra ilə oxuma belə davam edərkən hökmür-ra, tutmalar, idğami-məal günnənin burundan tələffüzü, vəqfi-izdirari (nəfəsin yetmədiyi yerdə durma), məd ölçülərinin tətbiq edilməsinə diqqət göstərilir. Xətmlər, açılan hər hansı bir səhifəni yanlışsız olaraq ən uzağı iki dəqiqədə oxuyana qədər təkrarlanır. Bu çalışmanın sonunda tələbə əzbərləyəcəyi Quranı çox sürətli oxuya bilməlidir ki, bir həftədə Quranı xətm edəcək səviyyəyə gəlsin. Bu çalışmaya əzbər öncəsi çalışma deyilir.

**2. Əzbərə başlama dövrü**

Öncə əzbər yoxlaması olaraq cüz başları dediyimiz, hər cüzün son səhifəsi ən uzağı bir aylıq iş günü olaraq verilir. Hər gün bir səhifə əzbərləyə bilməyən hafız ola bilməz. Gündə birdən çox səhifə əzbərləyə bilənlər seçilir. Sınaqdan keçirildikdən sonra onlara qabiliyətləri nisbətində səhifə verilir. Əgər belə edilməzsə zəkalı tələbələrin bu qabiliyyətləri istifadə edilməmiş olur. Eyni zamanda bu tip uşaqlar dərslərini daha tez bitirəcəkləri üçün digərlərini də məşgul edirlər. Müasir pedagojinin ən son qəbul etdiyi müsbət təlim-tərbiyə bacarığı da tələbənin qabiliyyətinə görə program tətbiq etməsidir.

# ƏDƏBİYYAT


**Ayni**, Bədrəddin Mahmud b. Əhməd, *Umdətul-Qari li Şərhi Sahihil-Buxari,* İstanbul 1954.

**Buxari,** Əbu Abdillah Muhamməd b. İsmayıl b. İbrahim b. əl-Muğirə, *Camiussəhih, İstanbul 1315.*

**Əbu Davud**, Süleyman b. Əş'as b. İshaq, Sünəni Əbi Davud, nşr, Əhməd Said Ali, Misir 1952.

**Ünlü,** Demirhan, *Kur'an-ı Kerim Tecvidi*, Diyanet İşleri Vakfı Yayınları, Ankara 1999.

**İbnul-Cəzəri**, Əbul-Xeyr Muhamməd b. Muhamməd, *Müqəddimə,* İstanbul 1310.

**------------,** ən-Nəşr fi Qıraatil'-Aşr, Misir tarixi yox, Nşr, Ali Muhamməd əd-Dəbba

**İbn Macə**, Əbu Abdullah Muhamməd əl-Qəzvini, Sünən, nşr: Fuad Abdulbaqi, Qahirə 1952.

**Karacam**, İsmail, *Kur'an-ı Kerimi Okuma Faziletleri ve Okuma Kaideleri*, Marmara Üniversitesi İlahiyat Fakültesi Vakfı yayınları.

**-------------**, *Kıraat İlminin Kur'an Tefsirindeki Yeri ve Mütevatir Kıraatların Yorum Farklılıklarına Etkisi*, Marmara Üniversitesi İlahiyat Fakültesi Vakfı yayınları.

**Nəsai, Əbu Abdirrahman b.** Şuayb, Sünəni Nəsai, Misir 1964.

**Sofuoğlu**, Mehmet, *Sahih-i Müslim ve Tercemesi,* İstanbul 1967.

**Süyuti,** Cəlaləddin, *əl-İtqan fi Ulumil Quran,* Qahirə 1967.